رَبِّ اشْرَحْ لِي صَدْرِي ﴿٢٥﴾

وَيَسِّرْ لِي أَمْرِي ﴿٢٦﴾

وَاحْلُلْ عُقْدَةً مِنْ لِسَانِي ﴿٢٧﴾

يَفْقَهُوا قَوْلِي ﴿٢٨﴾

**«Ey Rəbbim! Köksümü açıb genişlət;**

**işimi yüngülləşdir;**

**dilimdəki düyünü aç ki,**

**sözümü yaxşı anlasınlar!»**

(Ta Ha, 25-28)

# MÜQƏDDİMƏ

Şükr və tərif Allaha məxsusdur, biz Ona şükr edirik, Onu tərif edirik, Onu köməyə çağırırıq, Ondan bağışlanma diləyirik, nəfslərimizin şərindən və pis əməllərdən qorunmaq üçün Allaha sığınırıq. Allahın haqq yoluna yönəltdiyi şəxsi azdıran, azdırdığı şəxsi isə haqq yoluna yönəldən tapılmaz. Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə haqqı olan məbud yoxdur, Onun şəriki yoxdur və şahidlik edirəm ki, Məhəmməd Onun qulu və elçisidir.

يَا أَيُّهَا الَّذِينَ آمَنُوا اتَّقُوا اللَّهَ حَقَّ تُقَاتِهِ وَلَا تَمُوتُنَّ إِلَّا وَأَنْتُمْ مُسْلِمُونَ ﴿١٠٢﴾

**«Ey iman gətirmiş kəslər! Allahdan lazımınca qorxun və yalnız müsəlman olduğunuz halda ölün!»**[1]

يَا أَيُّهَا النَّاسُ اتَّقُوا رَبَّكُمُ الَّذِي خَلَقَكُمْ مِنْ نَفْسٍ
وَاحِدَةٍ وَخَلَقَ مِنْهَا زَوْجَهَا وَبَثَّ مِنْهُمَا رِجَالًا كَثِيرًا وَنِسَاءً
وَاتَّقُوا اللَّهَ الَّذِي تَسَاءَلُونَ بِهِ وَالْأَرْحَامَ إِنَّ اللَّهَ كَانَ عَلَيْكُمْ
رَقِيبًا ﴿١﴾

**«Ey insanlar! Sizi tək bir şəxsdən** (Adəmdən) **xəlq edən, ondan zövcəsini** (Həvvanı) **yaradan və onlardan da bir çox kişi və qadınlar törədən Rəbbinizdən qorxun! Adı ilə bir-birinizdən** (cürbəcür şeylər) **istədiyiniz Allahdan, həmçinin qohumluq əlaqələrini kəsməkdən həzər edin! Şübhəsiz ki, Allah sizin üzərinizdə nəzarətçidir!»**[2]

---

[1] Ali İmran surəsi, 102.
[2] ən-Nisa surəsi, 1.

يَا أَيُّهَا الَّذِينَ آمَنُوا اتَّقُوا اللَّهَ وَقُولُوا قَوْلًا سَدِيدًا ﴿٧٠﴾ يُصْلِحْ لَكُمْ
أَعْمَالَكُمْ وَيَغْفِرْ لَكُمْ ذُنُوبَكُمْ ۗ وَمَن يُطِعِ اللَّهَ وَرَسُولَهُ فَقَدْ فَازَ فَوْزًا
عَظِيمًا ﴿٧١﴾

**«Ey iman gətirənlər! Allahdan qorxun və doğru söz söyləyin!** (Əgər belə etsəniz) **Allah əməllərinizi islah edər və günahlarınızı bağışlayar. Hər kəs Allaha və Onun elçisinə itaət etsə, böyük bir səadətə nail olar»**[1]

İslam öz gəlişi ilə insanlara hürriyət və xoşbəxtlik bəxş edən, onları kor-koranə həyat tərzindən uzaqlaşdıran, cəhalətin insan təbiəti üçün tamamilə yararsız bir hal olduğunu göstərən və bundan yaxa qurtarmağı isə Adəm oğlundan qəti şəkildə tələb edən, yaradılan canlıların ən üstünü olan şüurlu varlıq üçün ən gözəl və əvəzedilməz məişət qaydaları müəyyən edən, öz prinsipləri ilə insanda ən çıxılmaz və dözülməz şəraitdə belə düşdüyü vəziyyətdən çıxış yolu tapa biləcəyinə inam yaradan, bir dindir. İlk baxışda yuxarıda sadaladığımız və sadalamadığımız bu müsbət keyfiyyətlərin insanın qısa vaxtda özündə formalaşdıra biləcəyi ağıla sığılmaz görünsə də bu saf və hər cür təhrifdən uzaq dinin ərkan və sütunları ilə tanış olduqda bunun həqiqətən mümkünlüyünə şübhə yeri qalmır. Bir halda ki, səadət bu qaydalara riayət etməkdirsə onda ilk öncə bu qaydaları öyrənməyimiz, bilməyimiz kimi zərurət meydana çıxır. Elə bu səbəbdən də soydaşlarımızı bu sahədə marifləndirməyi qarşımıza məqsəd qoymuşuq. Dəyərli oxucularımıza təqdim etdiyimiz bu risalə aləmlərin Rəbbi olan Uca Allahın vacib buyurduğu, dinimizin ikinci əsası haqqındadır. Bu əsasın tələblərinə riayyət etmək isə bütün sıxıntı, üzüntü, çətinlik və problemlərin mövcud olmasına baxmayaraq fərz edilmişdir. Təbii ki, söhbətimiz namaz və onunla birbaşa bağlı

[1] əl-Əhzab surəsi, 70-71.

olan təharət (paklanmaq) haqqında olacaqdır. Namaz barəsində Uca Allah belə buyurur:

إِنَّ الصَّلَوٰةَ تَنْهَىٰ عَنِ الْفَحْشَاءِ وَالْمُنكَرِ

«**Həqiqətən, namaz** [insanı] **çirkin və pis əməllərdən çəkindirər.**»[1]

İnanırıq ki, bir çox soydaşlarımız bu ayə barəsində müəyyən bilgilərə malikdirlər. Lakin biz, ona da inanırıq ki, təssüflər olsun bunu unudanlarımız da çoxdur. İnsanların bu qədər unutqan olduğunu əzəli elmi ilə bilən Rəbbimiz Adəm övladlarına Öz kitabı vasitəsilə daim bildiyi məsələləri belə yenidən təkrarlamağı və xatırlamağı tövsiyyə edib buyurur:

وَذَكِّرْ فَإِنَّ الذِّكْرَىٰ تَنفَعُ الْمُؤْمِنِينَ ﴿٥٥﴾

**«Sən** [onlara] **xatırlat! Çünki xatırlatmaq möminlərə fayda verir.»[2]**

Bu kitabı yazmaqda digər bir məqsədimiz də namaz və təharətlə bağlı mövcud olan fikir müxtəlifliyi və anlaşılmazlıqlara son qoymaqdır. Çünki hamımıza məlumdur ki, dinimizdən zorla ayrı salındığımız illərdə şəriətin digər məsələlərində olduğu kimi, İslamın bu ərkanına da bəzi bidətlər (əlavələr, yeniliklər) edilmiş, bəzi hallarda isə ümumiyyətlə İslam peyğəmbərinin, bəşəriyyətin ən xeyirlisinin - **səllallahu aleyhi və səlləmin** - sünnəsinə (dediklərinə) aid məsələlər əskildilmişdir. Lakin çoxları bu yenilik və əskiklərin fonunda namazın və ya dəstamazın batil olacağından xəbərsizdilər. Ümumiyyətlə hər bir müsəlman bilməlidir ki, dinlə bağlı hər hansı bir əməl yerinə yetirildikdə bu əməlin Allah tərəfindən qəbul olunması üçün iki hal mövcud olmalıdır:

---

[1] əl-Ənkəbut surəsi, 45;
[2] əz-Zariyat surəsi, 55;

Birincisi bu əməl heç bir kənar niyyətlə deyil, sırf ixlasla Allah rizasını qazanmaq üçün olmalı, ikincisi isə bu əməl məhz Peyğəmbərimizin - **səllallahu aleyhi və səlləm** - etdiyi kimi (sünnəsinə uyğyn olaraq) olmalıdır. Bu iki şərtdən birinin olmaması həmin ibadəti (namazı, dəstamazı, orucu, zəkatı və s.) batil edir. Elə bu səbəbdən də biz bu məsələ ətrafında mövcud fikir ayrılığına son qoymaq üçün risaləmizi yalnız və yalnız Quran ayələri və səhih istinadlı hədislər əsasında yazmışıq. Bu kitabda qeyd olunanlar fiqhi məsələlər olduğu üçün çalışmışıq ki, islam alimlərinin rəylərini də nəzərə alaraq Quran və mötəbər hədislərin dəstəklədiyi hökmləri burada əks etdirək. Ancaq adətdir ki, hər bir əsər yazılandan sonra, "bunu artırsaydı daha yaxşı olardı", "bunu yazmasaydı daha gözəl olardı" deyənlər çox olar. Şübhəsiz ki bu, insan əməyinin bəhrəsidir. Bu tərcümənin nöqsanlardan və xətalardan xali olmadığı üçün, bu barədə qeyd və mülahizələrini bildirəcək oxuculara əvvəlcədən təşəkkür edirik. Onların dəyərli məsləhətləri bu kitabın gələcək nəşrlərində nəzərə alınacaqdır. Kamillik təkcə Allaha məxsusdur, məsum olan isə insanların ən şərəflisi Məhəmməd peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dir.

Uca Allahdan hər bir əməlimizin ixlasla yalnız Onun üçün edilməsini və Onun Peyğəmbərinin - **səllallahu aleyhi və səlləm** - yolunda olmasını diləyirik! Oxucularımıza bu yolda uğurlar, xeyir və bərəkət arzulayırıq. Unutmayaq ki, biz yalnız Allah üçün yaşayırıq və sonda Ona da dönəcəyik. O, hər şeyin hesabını tez çəkəndir!

## « T Ə H A R Ə T »

Təharət kəlməsi iki cür izah olunur:

Lüğəti mənası paklıq deməkdir. Dində isə (istilahi mənada) murdar şeylərdən təmizlənməyə deyilir.[1]

Murdar şeylərdən təmizlənmənin özü də iki qismə bölünür:

Birincisi mənəvi təmizlikdir. Yəni qəlbi şirkdən, küfrdən, nifaqdan və s. bu kimi **Allahın** və Onun elçisinin - **səllallahu aleyhi və səlləm** - qadağan etdiyi günahlardan təmizləmək. Günahlardan təmizlənməyən şəxs cismani təmiz olsa da belə **Allah** qatında murdar hesab olunur. Uca **Allah** buyurur:

يَاأَيُّهَا الَّذِينَ آمَنُوا إِنَّمَا الْمُشْرِكُونَ نَجَسٌ

**«Ey iman gətirənlər! Müşriklər doğrudan da murdardırlar.»[2]**

Əbu Hüreyrə (r.a) rəvayət edir ki, cənabət[3] halında Mədinənin küçələrindən birində Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - ilə rastlaşdım. Gizlincə ondan uzaqlaşıb gedib qüsl etdim, sonra Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - yanına qayıtdım. O: «Əbu Hüreyrə, harada idin?» – deyə soruşduqda, mən dedim: «Mən cənabət halında idim. Belə natəmiz halda da sənin yanında oturmaq istəmədim». O dedi: «Subhənallah! *Müsəlman[4] murdarlanmaz!*» [5]

İkincisi cismani təmizlikdir. Yəni bədəni, geyimi və yeri murdar şeylərdən su və s. ilə təmizləmək.

---

[1] Bax: «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 1/29; «əl-Mu'cəmu-l-Vasit» səh: 568.

[2] ət-Tövbə surəsi, 28-ci ayə.

[3] Cinsi əlaqədən və ya hər hansı yolla şəhvətlə məni ifraz edilməsindən sonrakı hal.

[4] Başqa bir rəvayətdə: mömin.

[5] Səhihu-l-Buxari, 283; Səhih Muslim, 822, 823.

## ***Suyun növləri***

Bir çox İslam alimləri suyu iki qismə bölmüşlər.

Birincisi: Dəniz, göl, çay, bulaq, yağış, qar və s. bu kimi təbii sulardır[1] ki, bunların vasitəsilə qüsl etmək, dəstəmaz almaq və murdar şeylərdən təmizlənməyə icazə verilir.

Qeyd etmək lazımdır ki, qüsl və ya dəstəmaza istifadə olunmuş su təmizdir[2], lakin bu su ilə bir daha qüsl və ya dəstəmaz almaq olmaz. Yalnız qüsl və dəstəmaz aldıqda bədəndən qabın içinə sıçrayan su müstəsnadır.

Aişə (r.a) deyir ki, «Mən Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - ilə bərabər bir qabdan su götürərək qüsl edərdik»[3]

İkincisi: Murdar şeylər və ya kimyəvi maddələr qatışmaqla öz xüsusiyyətlərini (iyi, dadı və ya rəngi) dəyişmiş sulardır ki, belə su ilə də paklanmaq (qüsl etmək, dəstəmaz almaq) qadağandır. Yalnız bu suların xüsusiyyətlərinin təbii şəkildə (ağac yarpağı, yosun, mamır və s. ona qatışmaqla) dəyişilməsi halı müstəsnadır. Həmçinin murdar şeylər qatışmış lakin xüsusiyyətləri dəyişilməmiş sular da (dəniz, çay və s.) müstəsnadır. Bu cür sularla paklanmaq olar. Lakin suyun miqdarı az olarsa və nəcasətin ona qatışdığı gözlə müşahidə olunarsa (və ya yəqin bilinərsə) bu zaman onunla paklanmaq olmaz.

## ***Murdar şeylərin (nəcasətin) növləri***

**1.** Leş; Bura ölmüş və ya şəriət qaydası ilə kəsilməmiş heyvanlar[4] daxildir.[5] Həmçinin heyvan sağ ikən ondan kəsilib ayrılmış müəyyən üzvü də buna aiddir. Yalnız murdar sayılmayan heyvanın kəsilib ayrılmış buynuzu, dırnağı və tükü müstəsnadır. Heyvanın dərisi isə yalnız aşılandıqdan sonra təmiz hesab olunur.

---

[1] Ərəbcə buna «tahur» deyilir.

[2] (ayaqyolunda, qab yumaq və s. üçün istifadə etmək olar)

[3] Səhihu-l-Buxari, 273; Səhih Müslim, 729.

[4] Qeyd etmək lazımdır ki, əti yeyilməyən heyvan şəriət qayda-qanunu ilə kəsilmiş olsa da belə onun cəmdəyi murdar sayılır.

[5] Bax: əl-Ənam surəsi, 145-ci ayə.

Ölmüş heyvanlardan aşağıdakılar təmiz hesab olunur:

a) Balıq[1] və çəyirtkə;

İbn Ömər (r.a) demişdir: «İki leş və İki qan bizə halal edilmişdir. İki leş balıq və çəyirtkədir, iki qan isə ciyər və dalaqdır.»[2]

b) Axar qanı olmayan milçək, ağcaqanad, mətbəx böcəyi, əqrəb və digər həşəratlar.[3]

**2.** Qan[4]; Qan özü iki qismə bölünür:

a) Murdar: Bura ön və arxa ifrazat çıxışlarından gələn qan, axar qanı olan və ətinin yeyilməsi haram buyurulmuş heyvanın qanı, ölmüş və ya şəriət qayda-qanunu ilə kəsilməmiş heyvanın qanı daxildir.

b) Təmiz: Bura insan qanı, balıq qanı, axar qanı olmayan həşəratların qanı, şəriət qayda-qanunu ilə kəsilmiş heyvanın cəsədində qalan qan daxildir.

**3.** İnsan və əti yeyilməyən heyvanların sidiyi və nəcisi;

Ənəs ibn Malik (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - ayaqyoluna getdikdə mən onun üçün su[5] aparardım. O da su ilə təmizlənərdi»[6]

**4.** Məzi; Bu şəhvət hissi keçirdikdə cinsiyyət üzvündən təkansız, özbaşına süzülən ağ (şəffaf) rəngli mayedir.

Əli ibn Əbu Talib (r.a) deyir ki, məndən çoxlu məzi ifraz olunurdu. Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - kürəkəni olduğum üçün bunun hökmünü ondan soruşmağa utanırdım. Ona görə də əl-Miqdad ibnu-l-Əsvədi (r.a) bu məsələnin hökmünü öyrənmək üçün onun yanına göndərdim. Rəsulullah - **səllallahu aleyhi və səlləm** -: «Cinsiyyət üzvünü yusun və dəstəmaz alsın» – deyə cavab verdi[7].

---

[1] Suda-quruda yaşayanlar bura daxil deyildir.
[2] «Müsnəd» 2/97; İrvau-l-Ğalil, 8/164 – 2526-cı hədis. **[Hədis səhihdir]**
[3] Bax: «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 1/534.
[4] Bax: əl-Ənam surəsi, 145-ci ayə.
[5] Dəridən hazırlanmış kiçik su qabında.
[6] Səhih Muslim, 620.
[7] Səhihu-l-Buxari, 269; Səhih Muslim, 693.

**5.** Donuz[1] və it;

Əbu Hüreyrə rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm-** dedi: «İt, sizdən birinizin qabından (su və s.) içərsə, o qabı yeddi dəfə yuyun!»

Müslimin əlavəsində: «Birincisini torpaqla[2]»[3]

**6.** Məni (sperma).

Yalnız əti yeyilməyən heyvanların mənisi murdar hesab olunur.

Aişə (r.a) rəvayət edir ki, «mən Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - üzərinə məni düşmüş paltarını əlimlə ovxalayardım»[4]

Nəticə: Məni murdar olmuş olsa idi Aişə (r.a) onu ovxalamaqla kifayətlənməzdi və onu yuyardı.

## ***Yerin təmizlənməsi***

Əgər namaz qılınan yerdə olan nəcis maye halındadırsa onun təmizlənməsi həmin yerə su tökməklə və ya günəş şüaları altında müəyyən müddət qalmaqla olur.

Əgər nəcis maye halında deyilsə onu həmin yerdən kənarlaşdırıb yerinə su tökməklə təmizləmək lazımdır.

Ənəs ibn Malik rəvayət edir ki, «Bir bədəvi[5] gəlib məscidin içini (ora su başına çıxmaqla) batırdı. Səhabələr onu qovub məsciddən çıxarmaq istədikdə Peyğəmbər - **səllallahu aleyhi və səlləm –** icazə vermədi. Sonra onun batırdığı yerə bir qab su tökməyi əmr etdi və ora su töküldü»[6]

---

[1] Bax: əl-Ənam surəsi. 145-ci ayə.
[2] Yeddi dəfədən birini torpaqla yumaq.
[3] Səhihu-l-Buxari, 172; Səhih Muslim, 648, 649.
[4] Səhih Muslim, 672.
[5] Səhrada yaşayan (köçəri) ərəb.
[6] Səhihu-l-Buxari, 221; Səhih Muslim, 657, 658.

Günəş şüaları altında müəyyən müddət qalmaqla yerin təmizlənməsinə Əbu Hənifənin, ibn Teymiyyənin, ibn Üseyminin və bir çox islam alimlərinin rəyini əsas gətirmək olar.[1]

## ***Libasın təmizlənməsi***

Libasın üzərinə murdar şey düşərsə onu təmizlənənə qədər su ilə yumaq lazımdır. Uca **Allah** buyurur:



**«Libasını təmizlə»[2]**

Əsma bint Əbu Bəkr rəvayət edir ki, bir qadın gəlib Peyğəmbərə - **səllallahu aleyhi və səlləm** - dedi: «Ey **Allahın** elçisi! Bizdən birinin libasına heyz[3] qanı bulaşarsa o nə etsin? Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: Sizdən birinin libasına heyz qanı bulaşarsa onu su ilə sürtüb yusun…»[4]

Qeyd etmək lazımdır ki, südəmər (yalnız südlə qidalanan) oğlan uşağının sidiyi düşən paltarın üzərinə su çiləməklə kifayətlənmək olar.

Ummu Qeys bint Mihsan əl-Əsədiyyə (r.a) rəvayət edir ki, o, südəmər oğlunu gətirib Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - dizinin üstünə qoydu və uşaq onun paltarına sidik ifraz edib onu batırdı. Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - paltarının üzərinə yalnız su səpdi və onu yumadı»[5]

Qeyd etmək lazımdır ki, murdar şeyə bulaşmış ayaqqabını torpağa sürtməklə də (tam təmizlənənə qədər) təmizləmək olar.

Əbu Səid əl-Xudri (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «Sizdən biriniz məscidə gəldiyi zaman ayaqqabısının

---

[1] Bax: «Məcmu fətava» 21/474, 481; «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 1/502; «Haşiyətu ibn Abidin» 1/311.

[2] əl-Muddəssir surəsi, 4-cü ayə.

[3] Qadından hər ay adəti üzrə gələn qan.

[4] Səhihu-l-Buxari, 307.

[5] Səhihu-l-Buxari, 223; Səhih Muslim, 663.

altına baxsın, əgər o nəcasətə bulaşmışsa onu yerə (torpağa) sürtsün (təmizləsin)…»[1]

## ***<u>Subaşına çıxmağın ədəbləri</u>***

**1.** Subaşına çıxan şəxs elə yer seçməlidir ki, insanlar onun nə özünü görə bilsinlər, nə orqanizmdən qazburaxma zamanı ehtimal olunan səsi eşitsinlər, nə də ifrazatın və qazın iyini duya bilsinlər;

əl-Muğirə ibn Şöbə rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - ilə səfərdə idim. O subaşına çıxmaq üçün (gözdən itənədək) məndən uzaqlaşdı….»[2]

**2.** Ayaqyoluna daxil olduqda aşağıdakı duanı oxuyub daxil olmaq müstəhəbdır (bəyənilir);

Ənəs ibn Malik (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - ayaqyoluna daxil olduqda: «Allahummə inni əuzu bikə minə-l-xubsi və-l-xəbais!» (Allahım, şeytanlardan[3] və onların şərindən[4] sənə pənah aparıram!) – duasını oxuyardı.»[5]

**3.** Ayaqyolundakı adam heç nə danışmamalı, salam verib-almamalı, zərurət olmadan çağırana cavab verməməlidir;

Abdullah ibn Ömər rəvayət edir ki; «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - subaşına çıxmışdı, bir kişi gəlib ona salam verdi və o, bu salama cavab vermədi.»[6]

**4.** Subaşına çıxan şəxs qibləyə təzim etmək, onun ehtiramını gözləmək naminə üzünü və ya arxasını qibləyə çevirməməlidir;

---

[1] «Müsnəd» 1/92; «İrvau-l-Ğalil» 1/314. **[Hədis səhihdir]**
[2] Səhih Muslim, 628.
[3] Erkək və dişi cinlər.
[4] Günahlardan.
[5] Səhihu-l-Buxari, 142; Səhih Müslim, 829.
[6] Səhih Muslim, 821.

Əbu Əyyub əl-Ənsari (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «Ayaqyolunda üzünüzü və ya arxanızı qibləyə yönəltməyin, yalnız şərqə və ya qərbə tərəf yönəlin![1]»[2]

Əbu Əyyub (r.a) rəvayət edir ki: «Biz Şama gəldikdə, orada təharətxanaların[3] üzü qibləyə bina edildiyini gördük və **Allahdan** bağışlanmamızı diləyərək bacardığımız qədər o təharətxanalardan uzaqlaşdıq»[4]

**5.** Subaşına çıxan şəxs bədəninə nəcis və sidik dəyməsindən özünü gözləməlidir;

Abdullah ibn Abbas (r.a.) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - iki qəbrin yanında dayanıb dedi: «Bu qəbirdəkilər günah etdiklərinə görə əzab çəkirlər: onlardan biri sidik ifraz etdikdə ondan (üzərinə sıçramasından) özünü qorumazdı...»[5]

**6.** Subaşına çıxan şəxs insanların gedib-gəlmək üçün istifadə etdikləri yollardan və istirahət etmək üçün nəzərdə tutulan yerlərdən kənara çəkilməlidir;

Əbu Hureyrə (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «İki lənət olunandan çəkinin! Səhabələr: Ey **Allahın** elçisi! İki lənət olunanlar kimlərdir? – deyə soruşduqda o dedi: Bu, insanların gedib-gəlmək üçün istifadə etdikləri yollara və dincəlmək üçün kölgələndikləri yerlərə subaşına çıxan şəxsdir.»[6]

**7.** Subaşına çıxan şəxs axmayan durğun sulara, özünün çimdiyi suyun içinə nəcis və ya sidik salmamalıdır;

---

[1] Yəni, yan tərəf qibləyə yönəlməlidir.
[2] Səhihu-l-Buxari, 144; Səhih Müslim, 608.
[3] Tualet.
[4] Səhih Müslim, 3-cü cild, səh.149.
[5] Səhihu-l-Buxari, 218; Səhih Müslim, 675.
[6] Səhih Muslim, 617.

Əbu Hureyrə (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «Heç biriniz axmayan durğun suya sidik ifraz etməsin və (sidik ifraz etmişsə) onunla yuyunmasın!»[1]

**8.** Sidik ifraz etdikdə ayaq üstə durmaq bəyənilmir. Subaşına çıxan şəxs yalnız iki şərtlə bunu edə bilər;

a) Sidiyin paltarına və ya bədəninə sıçramayacağına əmin olduqda;

b) Başqalarının onun ayıb yerlərini görməyəcəyinə əmin olduqda.

Huzeyfə (r.a) Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - divarın arxasında ayaq üstə subaşına çıxdığını rəvayət etmişdir.[2]

**9.** Hər iki ifrazat üzvünün çıxışı su (tapılmadıqda isə daş və s.) ilə[3] təmizlənməlidir;

Ənəs ibn Malik (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - ayaqyoluna getdikdə mən və mənim kimi bir uşaq onun üçün su[4] və daş aparardıq. O isə su ilə təmizlənərdi»[5]

**10.** Ayaqyolunda sol əl ilə təmizlənmək lazımdır;

Əbu Qətadə əl-Haris ibn Rabi əl-Ənsari (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: Sizdən biriniz sidik ifraz etdikdə sağ əli ilə cinsiyyət üzvündən tutmasın, yuyunduqda[6] da sağ əli ilə yuyunmasın…»[7]

**11.** Ayaqyolundan çıxdıqda aşağıdakı duanı oxumaq müstəhəbdır (bəyənilir);

---

[1] Səhih Muslim, 654.

[2] Səhihu-l-Buxari, 225.

[3] Təmizləyici ehtiram olunan əşya (Quran ayəsi, hədis, şəkil və s.) qida məhsulu, peyin, sümük və bu kimi vasitələrdən olmamalıdır.

[4] Dəridən hazırlanmış kiçik su qabında.

[5] Səhihu-l-Buxari, 152; Səhih Müslim, 619.

[6] Nəcisdən təmizləndikdə.

[7] Səhihu-l-Buxari, 153; Səhih Müslim, 612.

Aişə (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - ayaqyolundan çıxarkən «Ğufranəkə» deyərdi.»[1]

Duanın tərcüməsi: **Allahım**, Səndən bağışlanma diləyirəm!

**12.** Ayaqyoluna sol ayaqla daxil olmaq və sağ ayaqla çıxmaq müstəhəbdır (bəyənilir).

Bir çox islam alimləri Peyğəmbərdən - **səllallahu aleyhi və səlləm** - rəvayət olunan hədisləri araşdırıb müqayisə etdikdən sonra bu qənaətə gəlmişlər.[2]

## ***Dəstəmaz***

Dəstəmaz kəlməsi iki cür izah olunur:

Lüğəti mənası təmizlik deməkdir. Dində isə (istilahi mənada) dörd əzanı xüsusi formada təmizləməklə **Allaha** ibadət etməyə deyilir.[3]

Uca **Allah** buyurur:

يَا أَيُّهَا الَّذِينَ آمَنُوا إِذَا قُمْتُمْ إِلَى الصَّلٰوةِ فَاغْسِلُوا وُجُوهَكُمْ وَأَيْدِيَكُمْ
إِلَى الْمَرَافِقِ وَامْسَحُوا بِرُؤُوسِكُمْ وَأَرْجُلَكُمْ إِلَى الْكَعْبَيْنِ

«**Ey iman gətirənlər! Namaz qılmağa durduğunuz zaman üzünüzü və əllərinizi dirsəklərinizə qədər** (dirsəkləriniz qə daxil olmaqla) **yuyun,** (yaş əlinizi) **başınıza məsh edin** (çəkin)**, ayaqlarınızı topuqlarınıza qədər** (topuqlarınız qa daxil olmaqla) **yuyun**…»[4]

---

[1] «Sünənu-t-Tirmizi» 1/12; İrvau-l-Ğalil 1/91–52-ci hədis. **[Hədis səhihdir]**

[2] Bax: «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 1/123.

[3] Bax: «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 1/210; «əl-Mu'cəmu-l-Vasit» səh: 1038.

[4] əl-Maidə surəsi, 6-cı ayə.

Nüeym əl-Muğmir Əbu Hüreyrədən (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: "Qiyamət günü ümmətimin dəstəmaz suyu dəydiyi üzləri, əlləri və ayaqları nur saçacaq.»[1]

Əbu Hüreyrə (r.a) rəvayət edir ki, sevimli Peyğəmbərimizin - **səllallahu aleyhi və səlləm** - : «Möminin bər-bəzəyi dəstəmaz suyunun dəydiyi əzalarındadır» – dediyini eşitdim.[2]

Əbu Hüreyrə (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «Sizdən birinizin dəstəmazı pozulduqda dəstəmaz almayınca **Allah** onun (dəstəmazsız qıldığı) namazını qəbul etməz»[3]

## ***<u>Dəstəmazın şərtləri</u>***

Dəstəmaz alan şəxs aşağıdakı şərtləri özündə cəm etməlidir:

**1.** Müsəlman olmaq;

Uca **Allah** buyurur:

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوٓا إِذَا قُمْتُمْ إِلَى ٱلصَّلَوٰةِ

**«Ey iman gətirənlər! Namaz qılmağa durduğunuz zaman…»**[4]

**2.** Həddi-büluğa çatmaq (bəzi alimlərin rəyinə görə);

**3.** Ruhi xəstə olmamaq;

Ömər ibnu-l-Xəttab (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «Üç şəxsin üzərindən qələm qaldırılıb (onlara günah yazılmır): Həddi-büluğa çatmamış uşaq, ruhi xəstə və yuxuda olan şəxs…»[5]

**4.** Təmiz su tapmaq;

---

[1] Səhihu-l-Buxari, 136.

[2] Səhih Müslim, 585.

[3] Səhihu-l-Buxari, 6954; Səhih Müslim, 536.

[4] əl-Maidə surəsi, 6-cı ayə.

[5] «Sünənu Əbi Davud» 12/50 – 4391-ci hədis; İrvau-l-Ğalil 2/4 – 297-ci hədis. **[Hədis səhihdir]**

Əbu Hureyrə (r.a) rəvayət edir ki, bir kişi gəlib Peyğəmbərdən - **səllallahu aleyhi və səlləm** - soruşdu: «Ey **Allahın** elçisi! Biz dənizə çıxdığımız zaman özümüzlə az miqdarda su götürürük. Onunla dəstəmaz alarıqsa, içməyə suyumuz qalmaz. Elə isə dəniz suyu ilə dəstəmaz ala bilərikmi? Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: Dənizin suyu təmizdir və içərisində ölmüş su heyvanları da halaldır.»[1]

**5.** Niyyət etmək;

Ömər ibnu-l-Xəttab (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «Əməllər niyyətlərə görədir…»[2]

**6.** Suyun dəriyə çatmasına mane olan hər bir amili (boya, lak və s.) aradan qaldırmaq və əzalarda quru yer saxlamamaq;

Ömər ibnu-l-Xəttab (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - bir nəfərin dəstəmaz alıb dabanlarını tam yumadığını görüb dedi: «Qayıt dəstəmazını tamamla[3]»[4]

**7.** Bədənin nəcasətdən təmizlənməsi (paklaşdırılması);

Əli ibn Əbu Talib (r.a) deyir ki, məndən çoxlu məzi ifraz olunurdu. Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - kürəkəni olduğum üçün bunun hökmünü ondan soruşmağa utanırdım. Ona görə də əl-Miqdad ibnu-l-Əsvədi (r.a) bu məsələnin hökmünü öyrənmək üçün onun yanına göndərdim. Rəsulullah - **səllallahu aleyhi və səlləm** -: «Cinsiyyət üzvünü yusun və dəstəmaz alsın» – deyə cavab verdi.[5]

**8.** Sidik və ya nəcisdən azad olmaq.

Aişə (r.a) rəvayət edir ki, «Mən Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** -: "Yemək gətirildiyi zaman, həmçinin öndən və arxadan çıxanı[6]

---

[1] «Muvatta» 1/22 – 12-ci hədis; «Müsnəd» 2/237; İrvau-l-Ğalil, 1/42–9-cu hədis. **[Hədis səhihdir]**

[2] Səhihu-l-Buxari, 1; Səhih Müslim, 4904.

[3] Çünki suyu dərinin hər yerinə çatdırmaq şərtdir.

[4] Səhih Muslim, 575.

[5] Səhihu-l-Buxari, 269; Səhih Müslim, 693.

[6] Sidik və nəcis.

dəf edərək (zorla saxlayaraq) namaz qılınmamalıdır" – dediyini eşitdim»[1]

## ***Dəstəmazın vacibləri***

Dəstəmaz aldıqda yerinə yetirilməsi vacib olan altı əməl var ki, bunlar da aşağıdakılardır:

**1.** Bir dəfə üzü (ağız və burun daxil olmaqla)[2] yumaq;

**2.** Bir dəfə əlləri dirsəklərə qədər (dirsəklər qə daxil olmaqla) yumaq;

**3.** Bir dəfə başı (qulaqlar da daxil olmaqla)[3] məsh etmək;

**4.** Bir dəfə ayaqları topuqlara qədər (topuqlar qa daxil olmaqla) yumaq;

**5.** Bu hərəkətləri ayədə qeyd olunduğu kimi ardıcıl (tərtiblə) etmək;

* Cabir ibn Abdullahın (r.a) rəvayət etdiyi hədisdə Peyğəmbər **- səllallahu aleyhi və səlləm -** «…**Həqiqətən Səfa və Mərva**[4] **Allahın əlamətlərindəndir**[5]**,** mən də **Allahın** başladığından başlayıram**"** deyib Səfa dağına qalxdı…»[6]

Bir çox islam alimləri bu hədisin ümumi ləfzindən nəticə çıxarmışlar ki, dəstəmazda **Allahın** buyurduğu tərtiblə olmalıdır.[7]

* Peyğəmbərin **- səllallahu aleyhi və səlləm -** necə dəstəmaz aldığını nəql edən səhabələrin hamısı onun ayədə xatırlanan ardıcıllıqla dəstəmaz aldığnı rəvayət etmişlər.[8]

**6.** Bu əzaları yuyarkən böyük fasilə verməmək.

---

[1] Səhih Müslim, 1246.

[2] Bu məsələdə alimlər ixtilaf etmişlər, ehtiyat üçün daima ağız və burunu yaxalamaq əfzəldir.

[3] Bu məsələdə alimlər ixtilaf etmişlər, ehtiyat üçün daima qulağa məsh etmək əfzəldir.

[4] Səfa və Mərva Kəbənin yaxınlığında yerləşən kiçik dağlardır.

[5] Əl-Bəqərə surəsi. 158-ci ayə.

[6] Səhih Muslim, 2941.

[7] Bax: «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 1/218.

[8] Bax: «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 1/218.

Ömər ibnu-l-Xəttab (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - bir nəfərin dəstəmaz alıb dabanlarını tam yumadığını görüb dedi: «Qayıt dəstəmazını tamamla»[1]

Başqa rəvayətdə: «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** – ona, qayıdıb yenidən dəstəmaz almağı əmr etdi»[2]

Dəstəmaz əsnasında (normal hava şəraitində) verilən fasilə istənilən əzanın qurumasına səbəb olarsa yenidən dəstəmaz alınmalıdır. Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - də bu səbəbdən ona yenidən dəstəmaz almağı əmr etdi.

## ***Dəstəmazın bəyənilən əməlləri (sünnələri)***

**1.** Dəstəmaza başladıqda «bismilləh» demək[3];

Əbu Hureyrə (r.a) Peyğəmbərdən - **səllallahu aleyhi və səlləm** – rəvayət etmişdir: «Dəstəmazsız namaz qılmayın, "bismilləh" demədən dəstəmaz almayın!»[4]

**2.** Misvakla dişləri təmizləmək;

Əbu Hüreyrə (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «Ümmətimə əziyyət olmasaydı, hər namaz üçün dişlərini misvakla təmizləməyi onlara əmr edərdim»[5]

**3.** Dəstəmaza başladıqda əlləri yumaq;

Amr ibn Əbu-l-Həsən Abdullah ibn Zeyddən (r.a) Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - dəstəmazı haqqında soruşdu. O, bir qab su istədi və Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - dəstəmazı kimi dəstəmaz aldı: qabdan su töküb üç dəfə əllərini yudu…[6]

**4.** Barmaqların arasını yumaq;

---

[1] Səhih Muslim, 575.

[2] «Müsnəd» 3/146; İrvau-l-Ğalil, 1/126 – 86-cı hədis. **[Hədis səhihdir]**

[3] Dörd məzhəbin rəyinə görə «bismilləh» demək müstəhəbdir. Bax: «Aunu-l-Məbud» 1/121;

[4] «Müsnəd» 2/418; İrvau-l-Ğalil, 1/122 – 81-ci hədis. **[Hədis həsəndir]**

[5] Səhihu-l-Buxari, 887; Səhih Müslim, 1450.

[6] Səhihu-l-Buxari, 186; Səhih Müslim, 554.

Sələmə ibn Qeys əl-Əşgəi (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və sələm** - dedi: «Dəstəmaz aldıqda əl və ayaq barmaqlarının arasını yu!»[1]

**5.** Sıx saqqalın dibinə su çatdırmaq (seyrək saqqalın dibinə suçatdırmaq isə vacibdir);

Ənəs ibn Malik (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dəstəmaz alarkən su götürüb onu saqqalının dibinə çatdırdı və dedi: «Rəbbim mənə belə əmr etdi»[2]

**6.** Əzaları iki və ya üç dəfə yumaq;

Amr ibn Əbu-l-Həsən Abdullah ibn Zeyddən (r.a) Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - dəstəmazı haqqında soruşdu. O, bir qab su istədi və Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - dəstəmazı kimi dəstəmaz aldı: qabdan su töküb üç dəfə əllərini yudu. Sonra sağ əli ilə qabdan su götürərək üç dəfə ağzını yaxaladı və burnunu (burnuna su alıb çıxarmaqla) təmizlədi. Sonra üç dəfə üzünü, iki dəfə də qollarını dirsəklərə qədər yudu, sonra əllərini suya saldı və yaş əllərini başının önündən arxasına doğru və əksinə çəkməklə bir dəfə məsh etdi və daha sonra ayaqlarını yudu.[3]

**7.** Əzaları sağ tərəfdən başlayaraq yumaq;

Aişə (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm –** geyindikdə, darandıqda, yuyunduqda və hər bir işində sağdan başlamağı xoşlayardı»[4]

**8.** Dəstəmazdan sonra aşağıdakı duanı oxumaq;

Ömər ibnu-l-Xəttab (r.a) Peyğəmbərdən - **səllallahu aleyhi və səlləm** - rəvayət etmişdir: «Sizdən biriniz dəstəmaz aldıqdan sonra bu duanı oxuyarsa: "Əşhədu ən lə iləhə illəllahu vəhdəhu lə şərikə ləhu va

---

[1] «Müsnəd» 1/287; «Silsilətu-l-əhadisi-s-sahihə» 3/291 – 1306-cı hədis.

[2] «Sünənu Əbi Davud» 1/167 – 145-ci hədis; İrvau-l-Ğalil 1/130 – 92-ci hədis. **[Hədis səhihdir]**

[3] Səhihu-l-Buxari, 186; Səhih Müslim, 554.

[4] Səhihu-l-Buxari, 426; Səhih Müslim, 615.

əşhədu ənnə muhamməden abduhu va rasuluhu"- onun üçün Cənnətin səkkiz qapısı açılar və o istədiyi qapıdan daxil olar.»[1]

Duanın tərcüməsi: Mən şahidlik edirəm ki, **Allahdan** başqa (ibadətə layiq olan) məbud (ilah) yoxdur, təkdir heç bir şəriki yoxdur və şahidlik edirəm ki, Məhəmməd Onun qulu və elçisidir».

**9.** Suyu israf etməmək.

Əlinin (r.a) nəvəsi Məhəmməd rəvayət edir ki, o, atası Hüseyn (r.a) və bir dəstə camaat Cabir ibn Abdullahdan (r.a) qüsl haqqında soruşdular. O dedi: «Bir saa[2] kifayət edər». Bir kişi: «Mənə kifayət etmir» – dedikdə, Cabir ona: «Səndən çox saçı olan və səndən də xeyirlisinə (yəni Peyğəmbərə - **səllallahu aleyhi və səlləm** -) kifayət edərdi» – deyib sonra bizə imamlıq edib namazı qıldırdı.[3]

## ***Dəstəmazı batil edən amillər***

**1.** Ön və arxa ifrazat çıxışlrından xaric olan sidik, nəcis, məzi, yel, istihazə halında gələn qan və s.

Uca **Allah** buyurur:

أَوْ جَاءَ أَحَدٌ مِنْكُمْ مِنَ الْغَائِطِ أَوْ لَمَسْتُمُ النِّسَاءَ فَلَمْ تَجِدُوا
مَاءً فَتَيَمَّمُوا صَعِيدًا طَيِّبًا

«…**ayaqyolundan gəldiyiniz və ya qadınlarla yaxınlıq etdiyiniz zaman su tapmasanız, pak torpaqla təyəmmüm edin**…»[4]

Əli ibn Əbu Talib (r.a) deyir ki, məndən çoxlu məzi ifraz olunurdu. Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - kürəkəni olduğum üçün bunun hökmünü ondan soruşmağa utanırdım. Ona görə də əl-Miqdad

---

[1] «Müsnəd» 4/145; Səhih Muslim, 552; İrvau-l-Ğalil, 1/134 – 96-cı hədis. **[Hədis səhihdir]**

[2] Yəni, dörd ovuc.

[3] Səhihu-l-Buxari, 252; Səhih Müslim, 731.

[4] əl-Maidə surəsi, 6-cı ayə.

ibnu-l-Əsvədi (r.a) bu məsələnin hökmünü öyrənmək üçün onun yanına göndərdim. Rəsulullah - **səllallahu aleyhi və səlləm** -: «Cinsiyyət üzvünü yusun və dəstəmaz alsın» – deyə cavab verdi.[1]

Abdullah ibn Zeyd ibn Asim əl-Mazini (r.a) rəvayət edir ki, namaz qılarkən nəfsinə şübhə[2] düşən bir kişi barəsində Peyğəmbərə - **səllallahu aleyhi və səlləm** - şikayət edildikdə o dedi: «Səs eşitməyincə və ya iy hiss etməyincə namazı tərk etməsin»[3]

Qeyd: Arxadan çıxan səssiz və iysiz hava da dəstəmazı batil edən amildir.

Aişə (r.a) rəvayət edir ki, Ummu Həbibə[4] (r.a) yeddi il istihazə[5] oldu və bu haqda Peyğəmbərdən - **səllallahu aleyhi və səlləm** - soruşdu. O: «Bu bir tərdir» – deyib yuyunmağı ona əmr etdi. Ummu Həbibə də hər namaz üçün yuyunardı.[6]

Qeyd etmək lazımdır ki, istihazə olan qadına hər namaz üçün qüsl etmək vacib deyil. Bir dəfə (heyzdən təmizləndikdən sonra) qüsl edib sonra isə yalnız dəstəmaz almaq kifayətdir.

**2.** Dərin yuxuya getmək və ya huşu itirmək;

Safvan ibn Assal (r.a) rəvayəi edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - bizə, səfərə çıxdığımız zaman üç gün üç gecə ərzində (yüngül və yaxud ağır) subaşına çıxdıqdan və yuxudan oyandıqdan sonra xuffu[7] ayağımızdan çıxarmamağa[8]bizə rüxsət verər, yalnız cənabət halında[9] onları çıxarmağı bizə əmr edərdi.[10]

---

[1] Səhihu-l-Buxari, 269; Səhih Muslim, 693.

[2] Yəni, ondan yel çıxdığını zənn etməklə çox vəs-vəsədə olan və namazdan yayınan.

[3] Səhihu-l-Buxari, 177; Səhih Müslim, 802.

[4] Ummu Həbibə bint Cəhş.

[5] Adəti üzrə gələn qandan çox (əlavə günlərdə) gələn qan.

[6] Səhihu-l-Buxari, 327; Səhih Müslim, 754.

[7] Dəridən hazırlanmış ayaq geyimi.

[8] Yəni, üzərinə məsh etməyi.

[9] Cinsi əlaqədən və ya hər hansı yolla şəhvət nəticəsində məni ifraz etdikdən sonrakı hal.

[10] «Müsnəd» 4/239; «Sünənu-n-Nəsai» 1/83 – 127-ci hədis; İrvau-l-Ğalil, 1/140 – 104-cü hədis. **[Hədis həsəndir]**

**3.** Dəvə əti yemək;[1]

Cabir ibn Səmura (r.a) rəvayət edir ki, bir kişi gəlib Peyğəmbərdən - **səllallahu aleyhi və səlləm** - soruşdu: «…Dəvə əti yedikdən sonra dəstəmaz alımmı? O dedi: Bəli, dəvə əti yedikdən sonra dəstəmaz al!…»[2]

Cabir ibn Səmura (r.a) rəvayət edir ki, biz dəvə əti yedikdən sonra dəstəmaz alardıq, qoyun əti yedikdən sonra isə dəstəmaz almazdıq.»[3]

**4.** Övrət yerinə bilavasitə toxunmaq. (Bəzi alimlərin rəyinə görə).

Busra bint Safvan (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «Cinsiyyət orqanına bilavasitə toxunan dəstəmaz alsın!»[4]

Talq ibn Ali (r.a) Peyğəmbərdən - **səllallahu aleyhi və səlləm –** namazda cinsiyyət orqanına toxunan dəstəmaz almalıdırmı? Deyə soruşdu. O dedi: «Xeyr, o səndən olan bir ət parçasıdır»[5]

Bu iki hədisi cəm edib aşağıdakı nəticəni çıxartmaq olar:

«Şəhvətlə və ya şəhvətsiz cinsiyyət orqanına toxunan şəxsin dəstəmaz alması müstəhəbdir. Şəhvətlə cinsiyyət orqanına toxunan şəxsin dəstəmaz almasının vacib olması rəyi də çox güclü rəydir, lakin mən bunu qətiyyətlə dəstəkləmirəm. Ehtiyat üçün isə dəstəmaz alsın.[6]»

İbn Teymiyyədən soruşdular: «Cinsiyyət orqanına əlinin iç hissəsi və barmaqları ilə toxunan şəxsin dəstəmazı pozulurmu?» O dedi: «Onu qəsd etməyibsə dəstəmazı pozulmur.»[7]

---

[1] «Təmamu-l-Minnə» səh:106.

[2] «Müsnəd» 5/86, 88, 93, 100; Səhih Muslim, 800; İrvau-l-Ğalil, 1/152 – 118-ci hədis. **[Hədis səhihdir]**

[3] «Musannəf ibn Əbi Şeubə» əsəri 1/46.

[4] «Müsnəd» 6/406; İrvau-l-Ğalil, 1/150 – 116, 117-ci hədislər. **[Hədislər səhihdir]**

[5] «Müsnəd» 4/23; Ali ibnu-l-Mədinin, ət-Təhavi, ət-Təbərani, ibn Həzm, İbn Teymiyyə, İbn Useymin və s. bu hədisi mötəbər hesab etmişlər.

[6] Bax: «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 1/325.

[7] «Məcmu fətava» 21/231; «Təmamu-l-Minnə» səh:103.

## ***Dəstəmazı batil etməyən amillər*** [1]

**1.** Ön və arxa ifrazat çıxışlarından başqa bədənin istənilən yerindən çıxan qan və s;

**2.** Qadına şəhvətlə və ya şəhvətsiz bilavasitə toxunmaq;

**3.** Odda bişmiş yeməkdən yemək;

**4.** Dəstəmazın pozulmasına şəkk etmək;

**5.** Qəh-qəhə ilə gülmək;

**6.** Meyitə toxunmaq;

**7.** Qusmaq;

**8.** Mürgüləmək;

**9.** Murdar şeyə toxunmaq; (murdar şeyə toxunduqda onu su ilə təmizləmək kifayətdir)

## ***Dəstəmaz almağın qaydası***

Dəstəmaz alan şəxs ürəyində dəstəmaz üçün niyyət edib dəstəmaz almaq istədiyini fikrindən keçirməli, bunu dillə deməməlidir. Çünki Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - nə dəstəmaz alandan, nə namaz qılandan, nə də hər hansı başqa bir ibadətdən qabaq niyyət edərkən niyyətini dillə deməmişdir (həcc və ümrə ziyarəti müstəsnadır). **Allahın** adını çəkib, yəni (bismilləh) deyib əlləri üç dəfə yumaq. Sonra üç dəfə ağzını yaxalamaqla burnuna su çəkib qaytarmaq və üzünü üç dəfə bir qulağından o birinədək eninə və başının tüklü yerindən başlamış çənənin (və ya saqqalın) aşağısınadək uzununa yumaq.[2] Sonra hər iki qolunu üç dəfə barmaqların ucundan dirsəklərə qədər (dirsəklər də daxil olmaqla) sağ qoldan başlamaq şərtilə yumaq.[3] Sonra yaş əllərlə başa məsh etmək. Yəni əlləri isladıb başın qabaq hissəsindən (alının sonundan) arxasınadək (boyunadək) çəkmək, sonra başladığı yerə qaytarmaq. Sonra şəhadət barmaqlarını qulaqların deşiklərinə salıb baş barmaqları qulaqların arxasına çəkməklə qulaqlara məsh etmək. Sonra

---

[1] Hər hansı bir amilin dəstəmazı batil etdiyini iddia edən şəxs onu sübuta yetirmək üçün dəlil gətirməlidir.

[2] Ağız, burun və üzün yuyulmasında ardıcıllıq vacib deyildir.

[3] Sağ qoldan başlamaq sünnədir.

ayaqları üç dəfə barmaqların ucundan topuqlara qədər (topuqlar da daxil olmaqla), əvvəl sağ, sonra sol ayağı yumaq.[1] Ayaqları yuyarkən barmaqların arası yuyulmalı və topuğun alt nahiyəsinə suyun çatmasına diqqət yetirilməlidir. Dəstəmaz alıb qurtardıqdan sonra aşağıdakı duanı oxumaq.

"Əşhədu ən lə iləhə illəllahu vəhdəhu lə şərikə ləhu va əşhədu ənnə Muhammədən abduhu va rasuluhu"

Duanın tərcüməsi: Mən şahidlik edirəm ki, **Allahdan** başqa (ibadətə layiq olan) məbud (ilah) yoxdur, təkdir heç bir şəriki yoxdur və şahidlik edirəm ki, Məhəmməd Onun qulu və elçisidir».

## ***Qüsl***

«Qüsl»**-** niyyət etməklə əzaların tam yuyulması deməkdir.[2]

## ***Qüslü vacib edən hallar***

**1.** Cinsi əlaqədən sonra (əlaqədə olanların hər hansı birindən, yaxud hər ikisindən sperma xaric olmamışsa belə), şəhvət hissi keçirmək nəticəsində yuxulu və ya ayıq olarkən sperma xaric olmuşsa. Uca **Allah** buyurur:

وَإِنْ كُنْتُمْ جُنُبًا فَاطَّهَّرُوا

«**Əgər cənabətli halda olmusunuzsa, qüsl edin** (bədəninizi başdan ayağa qədər yuyub təmizləyin).»[3]

Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - zövcəsi Ummu Sələmə (r.a) rəvayət edir ki, Əbu Təlhənin(r.a) zövcəsi Ummu Suleym (r.a) Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - yanına gəlib dedi: «Ey **Allahın** elçisi! Həqiqətən, **Allah** haqqı soruşana utanmağı əmr etmir. Məgər

---

[1] Sağ ayaqdan başlamaq sünnədir.

[2] «Fəthu-l-Bari» 1/428; «Şərhu Səhih Muslim» 3/219; «əl-Mu'cəmu-l-Vasit» səh: 652.

[3] əl-Maidə surəsi, 6-cı ayə.

qadın pollyusiya[1] halında qüsl etməlidir?» Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «Bəli, əgər məninin[2] əsər-əlamətini (paltarında və ya bədənində) görübsə qüsl etməlidir»[3]

**2.** Heyz (aybaşı) və nifasdan (doğuş qanından) təmizləndikdən sonra;

Aişə (r.a) rəvayət edir ki, Əbu Hübeyşin qızı Fatimə (r.a): «Mən davamlı istihazə[4] oluram. Buna görə namazımı tərk edimmi?» – deyə Peyğəmbərdən - **səllallahu aleyhi və səlləm** - soruşdu. O dedi: «Xeyr, o bir tərdir heyz deyil, lakin adətin üzrə heyz olduğun günlər namazları tərk et, sonra isə qüsl edib namazını qıl»[5]

Səhabələrin və islam alimlərinin rəyinə görə nifasla heyzin hökmü eynidir.[6]

Qeyd etmək lazımdır ki, qadın heyz və ya nifas müddətdə buraxdığı namazların qəzasını qılmamalı, orucların isə əksinə qəzasını tutmalıdır.

Muazə bint Abdullah (r.a) rəvayət edir ki, mən Aişədən (r.a): «Nə üçün heyzli qadın orucun qəzasını tutur, namazın qəzasını isə qılmır?» – deyə soruşdum. O məndən: «Sən Hərurisən[7]?» – deyə soruşduqda, mən: «Xeyr, Həruri deyiləm, lakin öyrənmək üçün soruşuram» – cavabını verdim. Aişə dedi: «Biz heyzli olarkən oruc və namazı tərk edir, sonra isə yalnız orucun qəzasını tutmağa əmr olunardıq»[8]

**3.** Cümə gününün qüslü;[9]

Abdullah ibn Ömər (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: "Cümə namazına gələn qüsl etməlidir"»[10]

---

[1] Yuxuda olarkən şəhvət nəticəsində məni ifraz etmək.
[2] Spermanın.
[3] Səhihu-l-Buxari, 282; Səhih Müslim, 710.
[4] Bax: 94-cü izahata.
[5] Səhihu-l-Buxari, 306; Səhih Müslim, 753.
[6] «Məcmu fətava» 21/635; Neylu-l-Əutar, 1/353.
[7] Hərura: Kufədən iki mil aralıda yerləşən şəhərdir. Burada Aişə (r.a) xaricilərin qolundan olan cərəyanı nəzərdə tutur.
[8] Səhihu-l-Buxari, 321; Səhih Müslim, 761.
[9] Bax: «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 5/108-110.
[10] Səhihu-l-Buxari, 894; Səhih Müslim, 1948.

Əbu Səid əl-Xudri (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: "Cümə gününün qüslü hər bir həddi buluğa çatana vacibdir"»[1]

**4.** Ölüm: Vəfat etmiş müsəlmanın meyiti qüsl olunmalıdır (şəhidlər müstəsnadır);

Abdullah ibn Abbas (r.a) rəvayət edir ki, «Bir kişi Ərafada[2] mindiyi heyvanın üzərindən yerə düşdü və boynu sındı. (Vəfat etdikdən sonra) Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: "Onu sidr qatılmış su ilə yuyub iki sarğı (kəfən) ilə sarıyın. Onu ətirləməyin və başını da örtməyin həqiqətən, o, Qiyamət günü təlbiyə[3] edərək həşr ediləcək[4]"»[5]

Cabir (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: "Onları (Uhud döyüşündə şəhid olanları) qanlı-qanlı (qüsl etmədən) dəfn edin!.."»[6]

**5.** İslam dininə daxil olmaq.

Qeys ibn Asim (r.a) rəvayət edir ki, İslam dinini qəbul etmək istədikdə Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - ona qüsl etməyi əmr etdi.[7]

## ***Hansı hallarda qüsl etmək bəyənilir?***

**1.** Meyit yumuş adamın qüsl etməsi ;

---

[1] Səhihu-l-Buxari, 879; Səhih Müslim, 1954; İrvau-l-Ğalil, 1/172 – 143-cü hədis.

[2] Məkkənin yaxınlığında yerləşən dağ və onun ətrafında olan yerin adıdır. Həmçinin, zi-l-hiccə ayının 9-u Ərafa günü adlanır.

[3] Bu duanı oxumaq: «ləbbeyk-əllahummə ləbbeyk, ləbbeykə lə şərikə ləkə ləbbeyk, innə-l-həmdə va-n-ni‘mətə ləkə va-l-mulk lə şərikə lək». Səhihu-l-Buxari, 1549.

[4] Həşr: Qiyamət günü insanların dirilərək haqq-hesab olunmaq üçün toplanmasına deyilir.

[5] Səhihu-l-Buxari, 1265; Səhih Müslim, 2884.

[6] Səhihu-l-Buxari, 1346.

[7] «Müsnəd» 5/61; «Sünənu Əbi Davud» 2/14 – 351-ci hədis; İrvau-l-Ğalil, 1/163 – 127-ci hədis. **[Hədis səhihdir]**

Əbu Hüreyrə (r.a) Peyğəmbərdən - **səllallahu aleyhi və səlləm** - rəvayət edir ki; «Meyiti yuyan qüsl etsin, onu daşıyan isə dəstəmaz alsın!»[1]

"Şübhə yoxdur ki, hədis səhihdir, lakin buradakı əmr bu əməlin müstəhəb olmasına dəlalət edir. Çünki, səhabələrdən varid olmuşdur ki, meyiti yuduqdan sonra onlardan bəziləri qüsl etmiş, digərləri isə etməmişdir."[2]

**[**Bu əmr vacib olsa idi Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - qüsl etməyən səhabələrə öz etirazını bildirərdi.**]**

**2.** Həcc və ümrə ziyarəti məqsədilə Məkkə şəhərinə daxil olmazdan əvvəl ihram libası geymək üçün qüsl edilməsi;

ibn Ömər (r.a) hər dəfə Məkkəyə gəldikdə səhərə qədər zi-Tuva adlı yerdə gecələyər, sonra qüsl edib Məkkəyə daxil olardı. O, rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - də belə edərdi.[3]

**3.** Yenidən cinsi əlaqəyə girmək üçün qüsl etmək;

Əbu Rafi (r.a) Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - belə etdiyini rəvayət etmişdir.[4]

**4.** İstihazə[5] olan qadınınhər bir namazı qılması üçün qüsl etməsi;

Aişə (r.a) rəvayət edir ki, Ummu Həbibə[6] (r.a) yeddi il istihazə oldu və bu haqda Peyğəmbərdən - **səllallahu aleyhi və səlləm** - soruşdu. O: «Bu bir tərdir» – deyib qüsl etməyi ona əmr etdi. Ummu Həbibə də hər namaz üçün qüsl edərdi.[7]

"Burada qüsl etmək üçün qeyd olunan əmr mütləqdir və təkrar etməyə dəlalət etmir. Ola bilsin ki, o, bunun vacib olmasını başa

---

[1] «Sünənu Əbi Davud» 8/304 – 3159-cu hədis; İrvau-l-Ğalil, 1/173 – 144-cü hədis. **[Hədis səhihdir]**

[2] İrvau-l-Ğalil, 1/175 – 144-cü hədisin şərhi. **[Hədis səhihdir]**

[3] Səhihu-l-Buxari, 1574; Səhih Müslim, 3270; İrvau-l-Ğalil, 1/179 – 150-ci hədis.

[4] «Sünənu Əbi Davud» 1/254–216-cı hədis; Ədəbu-z-Zifaf, səh: 35. **[Hədis səhihdir]**

[5] Bax: 94-cü izahata.

[6] Ummu Həbibə bint Cəhş.

[7] Səhihu-l-Buxari, 327; Səhih Müslim, 754.

düşmüş və hər namaz üçün qüsl etmişdir. Şafii demişdir: «Peyğəmbər **- səllallahu aleyhi və səlləm -** ona qüsl edib namaz qılmağı əmr etmişdir. O isə əlavə olaraq hər namaz üçün qüsl etmişdir».

əl-Leys ibn Səd, Muslimin rəvayətində belə demişdir: «Peyğəmbərin **- səllallahu aleyhi və səlləm -** ona (Ummu Həbibəyə (r.a) hər namaz üçün qüsl etməyi əmr etdiyini ibn Şihab qeyd etməmişdir. Bu, yalnız onun (Ummu Həbibənin (r.a) ictihadı nəticəsində) etdiyi hərəkətdir.» İcmanın da rəyi belədir ki, istihazə halında olan qadına hər namaz üçün qüsl etmək vacib deyildir."[1]

## ***<u>Qüslün rüknləri</u>***

Qüslün iki rüknü (əsası, tərkib hissəsi) var ki, onların hər ikisini yerinə yetirərək edilən qüsl düzgün sayılıır. Onlar aşağıdakılardır:

**1.** Niyyət etmək;

Ömər ibnu-l-Xəttab (r.a) rəvayət edir ki, Peyğəmbər **- səllallahu aleyhi və səlləm -** dedi: «Əməllər niyyətlərə görədir…»[2]

**2.** Bədənin hər yerinə (su dəyməmiş cüzi bir hissə saxlamamaq şərtilə) su çatdırmaq.

Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbər **- səllallahu aleyhi və səlləm -** cənabət qüslü etdikdə əllərini yudu. Sonra sağ əli ilə su töküb, sol əli ilə övrət yerini yudu. Sonra dəstəmaz aldı. Sonra üç dəfə başına su töküb əlləri[3] ilə onu saçlarının dibinə çatdırdı. Sonra bədəninin qalan yerini yudu. Axırda isə ayaqlarını yudu.»[4]

## ***<u>Qüsl etməyın qaydası</u>***

**Allah** dərgahında qəbul olunan etdiyi qüsl iki növdür:

---

[1] «Fəthu-l-Bari» 1/508 – 327-ci hədisin şərhi.
[2] Səhihu-l-Buxari, 1; Səhih Müslim, 4904.
[3] Barmaqlarını saçlarının arasına daxil etməklə.
[4] Səhih Müslim, 716.

**1.** Vacib qüsl. Yəni, niyyət edib bədənin hər yerinə su çatdırmaqla onu tərtibsiz (ardıcıllıq olmadan) yumaq. Bununla da bəndə boynunda olan vacibi ödəmiş hesab olunur.

**2.** Kamil qüsl. Yəni, niyyət etdikdən sonra [bismilləh] deyib əlləri yumaq. Sonra cinsiyyət üzvünü yumaq. Sonra dəstəmaz almaq.[1] Sonra üç dəfə başa su töküb əl ilə onu saçların dibinə çatdırmaq. Sonra bədənin qalan yerini üç dəfə[2] yumaq. Sonra isə ayaqları yumaq (Yəni, Peyğəmbərin **- səllallahu aleyhi və səlləm –** etdiyi kimi qüsl etmək).

Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbər **- səllallahu aleyhi və səlləm -** cənabət qüslü etdikdə əllərini yudu. Sonra sağ əli ilə sol əlinin üzərinə su töküb övrət yerini yudu. Sonra dəstəmaz aldı. Sonra üç dəfə başına su töküb əlləri[3] ilə onu saçlarının dibinə çatdırdı. Sonra bədəninin qalan yerini yudu. Sonra isə ayaqlarını yudu.»[4]

Bədən üzvlərindən biri tənziflə sarınmış və ya gips qoyulmuş müsəlman dəstamaz almaq və qüsl etmək istədikdə sağlam üzvləri yumalı, sarınmış xəstə üzvün üstünə isə məsh çəkməlidir. Əgər məsh etmək yaraya ziyan edərsə bu vaxt təyəmmüm etmək lazımdırdir.

**Qüsldən sonra dəstəmaz almaq:**

Qüsldən sonra dəstəmaz alıb almamaq ondan əvvəlki niyyətlə bağlıdır. Qüsldən əvvəl olan niyyət isə dörd qismə bölünür.

**1.** Qüsl və dəstəmazı niyyət edib qüsl etmək dəstəmazı da əvəz edir.

**2.** Yalnız qüslü niyyət edib qüsl etmək də dəstəmazı əvəz edir.

Hər iki rəy aşğıdakı ayə və hədislə əsasnadırılıb:[5]

---

[1] Dəstəmaza başladıqda niyyət edib bismilləh demək və qurtardıqda duanı oxumaq lazım deyil.

[2] Əzaları sağdan başlayaraq iki və ya üç dəfə yumaq sünnədir. Bax: «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 1/415-420.

[3] Barmaqlarını saçlarının arasına daxil etməklə.

[4] Səhih Müslim, 716.

[5] Bax: «Məcmu fətava» 21/396; «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 1/428.

Uca **Allah** buyurur:

وَإِنْ كُنْتُمْ جُنُبًا فَاطَّهَّرُوا

«**Əgər cinsi əlaqədə olmusunuzsa, qüsl edin** (bədəninizi başdan ayağa qədər yuyub təmizləyin).»[1]

Ömər ibnu-l-Xəttab (r.a) rəvayət edir ki, Peyğəmbər **- səllallahu aleyhi və səlləm -** dedi: «Əməllər niyyətlərə görədir…»[2]

**3.** Dəstəmazsız qəbul olmayan ibadəti (namaz və s.) niyyət edib qüsl etmək də dəstəmazı əvəz edir.

**4.** Dəstəmazsız yerinə yetirilməsi caiz olan ibadəti (Quran oxumaq, məsciddə etikaf[3] etmək və s.) niyyət edib qüsl etmək isə dəstəmazı əvəz etmir.[4]

## ***Təyəmmüm***

Lüğəti mənada qəsd etmək (yönəlmək), dində isə (istilahi mənada) təmiz torpağa qəsd edib onunla üz və əlləri məsh etmək deməkdir.[5]

Uca **Allah** buyurur:

وَإِنْ كُنْتُمْ مَرْضَىٰ أَوْ عَلَىٰ سَفَرٍ

أَوْ جَاءَ أَحَدٌ مِنْكُمْ مِنَ الْغَائِطِ أَوْ لَامَسْتُمُ النِّسَاءَ فَلَمْ تَجِدُوا

مَاءً فَتَيَمَّمُوا صَعِيدًا طَيِّبًا فَامْسَحُوا بِوُجُوهِكُمْ وَأَيْدِيكُمْ مِنْهُ

---

[1] əl-Maidə surəsi, 6-cı ayə.

[2] Səhihu-l-Buxari, 1; Səhih Müslim, 4904.

[3] Allaha ibadət məqsədilə bir müddət məsciddə qalmaq.

[4] Bax: «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 1/429.

[5] Bax: «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 1/437; «əl-Mu'cəmu-l-Vasit» səh: 1066.

«**Xəstələndiyiniz, səfərdə olduğunuz, ayaqyolundan gəldiyiniz və ya qadınlarla yaxınlıq etdiyiniz zaman su tapmasanız, pak torpaqla təyəmmüm edin, ondan üzünüzə və əllərinizə sürtün**.»[1]

## ***Nə zaman təyəmmüm etmək olar?***

**1.** Su tapılmadıqda və ya istər qüsl, istərsə də dəstəmaz alaraq paklaşmağa kifayət qədər su olmadıqda;[2]

**2.** Dəstəmaz almalı, yaxud qüsl etməli adam yaralı və ya xəstə olduqda halının pisləşməsindən, yaxud xəstəliyinin uzanmasından qorxduğu zaman;[3]

**3.** Hava çox soyuq olduqda, dəstəmaz alan, yaxud qüsl edən adam soyuq sudan istifadə etdiyi təqdirdə ona zərər toxunacağından qorxduqda, yaxud sudan istifadə etmək (qızdırmaq və s.) imkanı olmadıqda.[4]

Uca **Allah** buyurur:



«…**özünüz özünüzü öldürməyin! Həqiqətən, Allah sizə qarşı mərhəmətlidir!**»[5]

**4.** İçməli su sarıdan korluq çəkdikdə, xörək bişirmək üçün su çatmadıqda və digər zəruri məqsədlərdən ötrü suya ehtiyac olduqda;[6]

---

[1] əl-Maidə surəsi, 6-cı ayə.
[2] Bax: əl-Maidə surəsi, 6-cı ayə.
[3] Bax: əl-Maidə surəsi, 6-cı ayə.
[4] Bax: «Məcmu fətava» 21/398-399, 440-441; Neylu-l-Əutar, 1/320-322; Fiqhu-s-Sünnə, 1/60.
[5] ən-Nisa surəsi, 29-cu ayə.
[6] Bax: Fiqhu-s-Sünnə, 1/61.

**5.** Yaxınlıqda olan suya çatmaq mümkün olmadıqda, məsələn: düşmənin və ya yırtıcı heyvanın onun suya yaxınlaşmasına mane olduğu, yaxud canı, namusu və malından qorxduğu halda, həbsdə olduqda, yaxud suyu quyudan çıxarmağa gücü çatmadıqda və s.[1]

## ***Təyəmmümü batil edən amillər*** [2]

Əvvəldə göstərilmiş dəstəmaz və qüslü batil edən amillər təyəmmümü də batil edir.

Bura su tapılmadığı halda təyəmmüm edilmişsə, su tapılandan sonra onun batil olmasını və sudan istifadə etməyə imkanı olmadığı üçün təyəmmüm etmiş adamın bu imkanı əldə etməsini də əlavə etmək olar.

Təyəmmüm edib namaz qılmış şəxs su tapılandan sonra təyəmmümlə qıldığı namazı təkrar etməməlidir.

Təyəmmüm alınan namazın vaxtının çıxması həmən təyəmmümü batil etmir.

## ***Təyəmmüm etməyin qaydası***

Niyyət edib[3] [bismilləh][4] demək. Sonra ovucların içini təyəmmüm üçün seçilmiş yerə bir dəfə vurmaq.[5] Onlara yapışmış toz-torpağı üfürüb və ya bir-birinə çırpıb təmizləmək.[6] Sonra əlləri üzə çəkmək və bir-birinə sürtmək.[7]

Təyəmmüm yalnız təmiz torpaq[8] və buna bənzərlə[9] edilməlidir.

---

[1] Bax: Fiqhu-s-Sünnə, 1/61.

[2] Bax: «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 1/473 - 480; «Fiqhu-s-Sünnə», 1/62.

[3] Vacibdir.

[4] Sünnədir.

[5] Vacibdir.

[6] Sünnədir.

[7] Vacibdir.

[8] Sement, gips, əhəng və s. kimi kimyəvi maddələr qatışıqlı olmamalıdır.

[9] Daş, kəsək və s.

Su ola-ola səbəbsiz yerə təyəmmüm almaq şəriətə müxalifdir və bu cür qılınan namaz batildir. Ona ğörə də hətta namazın vaxtı çıxırsa da qüsl və ya dəstəmaz əvəzinə təyəmmüm etmək olmaz.[1] Su ilə qüsl və ya dəstəmaz alıb sonra namaz qılınmalıdır.

---

[1] «Təmamu-l-Minnə» səh:132.

## « N A M A Z »

Uca **Allah** buyurur:

وَمَا أُمِرُوا إِلَّا لِيَعْبُدُوا اللَّهَ مُخْلِصِينَ لَهُ الدِّينَ حُنَفَاءَ وَيُقِيمُوا الصَّلَوٰةَ
وَيُؤْتُوا الزَّكَوٰةَ وَذَٰلِكَ دِينُ الْقَيِّمَةِ ﴿٥﴾

«**Halbuki onlara əmr edilmişdi ki, Allaha – dini yalnız Ona məxsus edərək, digər bütün batil dinlərdən islama dönərək – ibadət etsinlər, namaz qılıb zəkat versinlər. Doğru-düzgun din budur!**»[1]

İbn Ömər (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «İslam beş əsas üzərində bina edilmişdir: **Allahdan** başqa ilahının olmaması və Məhəmmədin Onun elçisi olmasına şahidlik etmək, namaz qılmaq, zəkat vermək, həcc etmək və Ramazan orucunu tutmaq!»[2]

Malik ibnu-l-Huveyris (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «…Mənim necə namaz qıldığımı görürsünüz, siz də elə namaz qılın!…»[3]

Namaz kəlməsi iki cür izah olunur:

Lüğəti mənası dua deməkdir.[4] Dində isə (istilahi mənada) «məlum (xüsusi) olan kəlmələri ifadə etmək və hərəkətləri yerinə yetirməklə, təkbirlə başlanıb təslimlə qurtaran ibadətə deyilir.[5]

Namaz qılmaq, həddi-büluğa çatmış, ağlı başında olan hər bir müsəlmana vacibdir.

---

[1] əl-Bəyyinə surəsi, 5-ci ayə.

[2] Səhihu-l-Buxari, 8; Səhih Muslim, 113.

[3] Səhihu-l-Buxari, 631; Səhih Muslim, 1533.

[4] Bax: ət-Tövbə surəsi, 103-cü ayə; əl-Əhzab surəsi, 56-cı ayə; əl-Həcc surəsi, 40-cı ayə; «əl-Mu'cəmu-l-Vasit» səh: 522.

[5] Bax: «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 2/5; «əl-Mu'cəmu-l-Vasit» səh: 522.

Uca **Allah** buyurur:

إِنَّ الصَّلَوٰةَ كَانَتْ عَلَى الْمُؤْمِنِينَ كِتَٰبًا مَّوْقُوتًا ﴿١٠٣﴾

«…**Namaz möminlərə müəyyən vaxtlarda fərz** (vacib) **edilmişdir**.»[1]

Ömər ibnu-l-Xəttab (r.a) rəvayət edir ki, Peyğəmbər **- səllallahu aleyhi və səlləm -** dedi: «Üç şəxsin üzərindən qələm qaldırılıb (onlara günah yazılmır): Həddi-büluğa çatmamış uşaq, ruhi xəstə və yuxuda olan şəxs…»[2]

## ***<u>Namazın şərtləri</u>***

**1.** Təharətli olmaq (qüsl və ya dəstəmazlı, və ya onları əvəz edən təyəmmümlü olmaq);[3]

Səhvən və ya bilərəkdən bu şərti tərk edənin namazı batildir.

**2.** Hər namazı vaxtında qılmaq;

Uca **Allah** buyurur:

إِنَّ الصَّلَوٰةَ كَانَتْ عَلَى الْمُؤْمِنِينَ كِتَٰبًا مَّوْقُوتًا ﴿١٠٣﴾

«…**Namaz möminlərə müəyyən vaxtlarda fərz** (vacib) **edilmişdir**.»[4]

Əbu Amr əş-Şeybani[5] Abdullah ibn Məsudun (r.a) evini göstərib dedi: «Bu evin sahibi bizə dedi ki, mən Peyğəmbərdən **- səllallahu aleyhi və səlləm -** hansı əməlin **Allah** yanında daha sevimli olduğunu soruşdum. O dedi: "Vaxtında qılınan namaz"…»[6]

---

[1] ən-Nisa surəsi, 103-cü ayə.

[2] «Sünənu Əbi Davud» 12/50 – 4391-ci hədis; İrvau-l-Ğalil 2/4 – 297-ci hədis. **[Hədis səhihdir]**

[3] Bax: əl-Maidə surəsi, 6-cı ayə.

[4] ən-Nisa surəsi, 103-cü ayə.

[5] Adı: Səd ibn İyəs.

[6] Səhihu-l -Buxari, 527; Səhih Müslim, 250.

Səhvən və ya bilərəkdən vaxtından tez qılınan namaz batildir.[1]

* Vaxtından gec isə yalnız üzrlü səbəbə görə namaz qılmaq olar (yatıb qaldıqda, unutduqda, cərrahiyə əməliyyatında və s. bu kimi çox zəruri hallarda).

Əbu Hüreyrə (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «Namazını unudan xatırladığı zaman onu qılsın! Uca **Allah** buyurmuşdur: "**Məni xatırladıqda** (anmaq üçün) **namaz qıl!**"[2]»[3]

**3.** Bədəni, paltarı və namaz qılınan yeri nəcasətdən (murdarlıqdan) təmizləmək;

Əbu Hüreyrə (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «Sizdən birinizin dəstəmazı pozulduqda dəstəmaz almayınca **Allah** onun (dəstəmazsız qıldığı) namazını qəbul etməz»[4]

Uca **Allah** buyurur:



**«Libasını təmizlə»[5]**

Uca **Allah** buyurur:

وَعَهِدْنَا إِلَىٰ إِبْرَاهِيمَ وَإِسْمَاعِيلَ أَن طَهِّرَا بَيْتِيَ لِلطَّائِفِينَ وَالْعَاكِفِينَ

وَالرُّكَّعِ السُّجُودِ ﴿١٢٥﴾

**«İbrahimə və İsmailə: "Evimi** [Kəbəni] **təvaf edənlər, orada qalıb həmişə ibadətdə olanlar, rüku və səcdə ilə namaz qılanlar üçün** [bütlərdən və nəcasətdən] **təmizləyin!" – deyə tövsiyə etdik.»[6]**

---

[1] Bax: «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 2/89.
[2] Taha surəsi, 14-cü ayə.
[3] Səhih Müslim, 1558.
[4] Səhihu-l-Buxari, 6954; Səhih Müslim, 536.
[5] əl-Muddəssir surəsi. 4-cü ayə.
[6] əl-Bəqərə surəsi, 125-ci ayə.

Yalnız bilərəkdən paltarı, ya bədəni, yaxud da namaz qılınan yeri nəcasətdən (murdarlıqdan) təmizləmədən qılınan namaz batildir.[1] Səhvən və ya unutqanlıqdan belə halda qılınan namaz batil olmur.

**4.** Ayıb yerlərini (övrəti[2]) örtmək;

Uca **Allah** buyurur:

يَا بَنِي آدَمَ خُذُوا زِينَتَكُمْ عِنْدَ كُلِّ مَسْجِدٍ

**«Ey Adəm oğulları! Hər ibadət vaxtı** (namaz qıldıqda, məscidə gedərkən və ya təvaf edərkən) **gözəl libaslarınızı geyinin!..»[3]**

Libasın vəsfi:

* Əzaları göstərən şəffaf və ya dar olmamalı;

* Natəmiz olmamalı;

* Haram olmamalı (İpək (yalnız kişilərə), kafirlərə məxsus olan geyim, qəsb edilmiş, oğurlanmış və s. geyimlər);

* Narahat edən, zərərli olmamalı (bədəni dalayan, tikanlı və s.).

Aişə (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «**Allah,** hicabsız namaz qılan həddi-büluğa çatmış qadının namazını qəbul etməz!»[4]

*** Hicabın şərtləri:**

1. Əl və üzdən başqa bütün bədən üzvlərini örtməli;
2. Zinətli olmamalı;
3. Dar olmamalı;
4. Kişilərə və ya kafir qadınlara məxsus geyimlərə oxşamamalı;
5. Şəffaf olmamalı;
6. Diqqəti cəlb edici olmamalı;
7. Ətirlənmiş olmamalı.

---

[1] Bax: «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 2/229.

[2] Kişi üçün göbəkdən dizə qədər, qadın üçün isə əl və üzdən başqa bədənin hər yeri.

[3] əl-Əraf surəsi, 31-ci ayə.

[4] «Sünənu Əbi Davud» 2/243 – 637-ci hədis; İrvau-l-Ğalil, 1/214 – 196-cı hədis. **[Hədis səhihdir]**

Qeyd etmək lazımdır ki, yalnız birinci və beşinci bəndə riayət etmədikdə namaz batil olur.[1]

Qadın bu şərtlərə yalnız ona naməhram olanların yanında riayət etməlidir. Ona məhrəm olanların yanında isə şəriətin qoyduğu həddi aşmamaq şərtilə istədiyi kimi geyinə bilər. Yalnız həyat yoldaşı müstəsnadır. Onun yanında istənilən libası geyinə bilər.

**Övrət yerinin açılması namazı batil edirmi?**

a) Övrət yeri bilərəkdən açılarsa bu halda namaz batil olur. Bu halda onun az və yə çox miqdarda olması, üstündən az və ya çox vaxt keçməsi heç bir əhəmiyyət kəsb etmir. İstənilən halda bu, namazı batil edir.

b) Övrət yeri az miqdarda səhvən açılarsa bu halda namaz batil olmur.

v) Övrət yeri çox miqdarda səhvən açılar, və üstündən az vaxt keçərsə yenə namaz batil olmur.

q) Övrət yeri çox miqdarda səhvən açılar, və üstündən çox vaxt keçərsə bu halda namaz batil olur."[2]

Qeyd: "Üstündən az və ya çox vaxt keçərsə" – dedikdə namaz əsnasındakı vaxt qəsd olunur.

**5.** Qibləyə tərəf durmaq.

Uca **Allah** buyurur:

وَمِنْ حَيْثُ خَرَجْتَ فَوَلِّ وَجْهَكَ شَطْرَ الْمَسْجِدِ الْحَرَامِ
وَإِنَّهُ لَلْحَقُّ مِن رَّبِّكَ

**«Hər hansı bir yerə getdikdə [namaz vaxtı] üzünü Məscidül-hərama** [Kəbəyə] **tərəf çevir! Çünki Rəbbin tərəfindən göstərilən bu qiblə haqdır.»[3]**

[1] «Namazla əlaqəli mühüm fətvalar» səh: 17.
[2] Bax: «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 2/167-168.
[3] əl-Bəqərə surəsi, 149-cu ayə.

Aşağıdakı hallarda qibləyə tərəf durmaq şərt deyil:

a) Qorxu olduqda (düşməndən, vəhşi heyvandan və s.);

Uca **Allah** buyurur:

فَإِنْ خِفْتُمْ فَرِجَالًا أَوْ رُكْبَانًا فَإِذَا أَمِنتُمْ فَاذْكُرُوا اللَّهَ كَمَا عَلَّمَكُم
مَّا لَمْ تَكُونُوا تَعْلَمُونَ ﴿٢٣٩﴾

**«Əgər** (düşməndən və yırtıcı heyvandan) **qorxsanız,** (namazınızı) **piyada gedə-gedə və ya minik üstə qılın.** (Təhlükədən sovuşmağınıza) **əmin olduqda isə Allahı, bilmədiyiniz şeyləri** (namazı, duanı) **sizə** (Quran və peyğəmbər vasitəsilə) **nə cür öyrədibsə, o cür anın** (zikr edin, namaz qılın).**»**[1]

Abdullah ibn Ömər (r.a) qorxu namazı barəsində soruşulduqda demişdir: «piyada gedə-gedə və ya minik üstə, qibləyə tərəf və ya qiblədən yayınaraq namazınızı qılın»[2]

b) Qibləyə tərəf çevrilmək mümkün olmadıqda (xəstəlik, qibləni təyin edə bilməmək və s.);

Uca **Allah** buyurur:

لَا يُكَلِّفُ اللَّهُ نَفْسًا إِلَّا وُسْعَهَا

**«Allah heç kəsi qüvvəsi çatmayan işi** (görməyə) **vadar etməz.»**[3]

Uca **Allah** buyurur:

فَاتَّقُوا اللَّهَ مَا اسْتَطَعْتُمْ

**«Allahdan bacardığınız qədər qorxun.»**[4]

v) Fərz namazlarından başqa minik üzərində qılınan nafilə namazlarında;

---

[1] əl-Bəqərə surəsi, 239-cu ayə.
[2] Səhihu-l-Buxari, 4535.
[3] əl-Bəqərə surəsi, 286-cı ayə.
[4] ət-Təğabun surəsi, 16-cı ayə.

Cabir (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - minik üzərində getdiyi istiqamətə tərəf namaz qılar, fərz namazı qılmaq istədikdə isə minikdən düşüb qibləyə tərəf yönələrdi.[1]

Yalnız bilərəkdən qiblədən yayınanın namazı batil olur. Səhvən bunu edib namaz əsnasında xatırlayan dərhal səhvini düzəltməli (qibləyə tərəf dönməli), qılıb qurtardıqdan sonra namazı təkrar qılmamalıdır. Fərz namazlarını isə yalnız zəruri hallarda (nəqliyyatın namazın axır vaxtınadək dayanmayacağı təqdirdə, düşmənin, vəhşi heyvannı və s. hücum etmək təhlükəsi olduqda və s.) minik üzərində qılmaq olar.

**6.** Hər namaz üçün (qəlbdə) niyyət etmək.

Uca **Allah** buyurur:

وَمَآ أُمِرُوٓا إِلَّا لِيَعْبُدُوا ٱللَّهَ مُخْلِصِينَ لَهُ ٱلدِّينَ حُنَفَآءَ وَيُقِيمُوا ٱلصَّلَوٰةَ
وَيُؤْتُوا ٱلزَّكَوٰةَ ۚ وَذَٰلِكَ دِينُ ٱلْقَيِّمَةِ ﴿٥﴾

«**Halbuki onlara əmr edilmişdi ki, Allaha – dini yalnız Ona məxsus edərək, digər bütün batil dinlərdən islama dönərək – ibadət etsinlər, namaz qılıb zəkat versinlər. Doğru-düzgun din budur!**»[2]

Ömər ibnu-l-Xəttab (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «Əməllər niyyətlərə görədir…»[3]

Səhvən və ya bilərəkdən niyyəti tərk edənin namazı batildir.

## ***<u>Namazın rüknləri (əsasları)</u>***

**1.** Qiyam (namazı ayaq üstə qılmaq);

Uca **Allah** buyurur:

وَقُومُوا لِلَّهِ قَٰنِتِينَ ﴿٢٣٨﴾

---

[1] Səhihu-l-Buxari, 400; Səhih Muslim, 1616.

[2] əl-Bəyyinə surəsi, 5-ci ayə.

[3] Səhihu-l-Buxari, 1; Səhih Müslim, 4904.

«…**Allaha itaət üçün ayağa qalxın**.»[1]

* Qüvvəsi çatmayan şəxsə namazı ayaq üstə qılmaq vacib deyil.

İmran ibn Hüseyn (r.a) rəvayət edir ki, mən babasil xəstəliyinə tutulmuşdum və namaz barəsində Peyğəmbərdən - **səllallahu aleyhi və səlləm** - soruşdum. O dedi: «ayaq üstə qıl, bacarmırsansa oturmuş vəziyyətdə qıl, onu da bacarmırsansa uzanmış vəziyyətdə qıl!»[2]

* Qiyam yalnız fərz namazları üçün rükndur. Nafilə (əlavə qılınan) namazlarını isə oturmuş vəziyyətdə də qılmaq olar. Belə namazları ayaq üstə qılmaq sünnədir.[3] Gücü çatana oturub qıldığı nafilə namazına görə ayaq üstə qılınan namazın savabının yarısı yazılır.

Cabir (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - minik üzərində getdiyi istiqamətə tərəf namaz qılar, fərz namazı qılmaq istədikdə isə minikdən düşüb qibləyə tərəf yönələrdi.[4]

İbn Ömər (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - üzünü üzərinə mindiyi heyvanın getdiyi istiqamətə tutub, başı ilə işarə edərək namazını qılardı». Həmçinin İbn Ömər (r.a) də bunu edərdi.[5]

**2.** Təkbirlə (**Allahu** əkbər deməklə) namaza başlamaq;

Əbu Hureyrə (r.a) rəvayət edir ki, bir kişi Peyğəmbərə - **səllallahu aleyhi və səlləm** - dedi: «Mənə namaz qılmağ öyrət!» O dedi: «Namaz qılmağa durduğun zaman təkbir et!…»[6]

**3.** Hər rək'ətdə Fatihə surəsini oxumaq;

Ubadə ibnu-s-Samit (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «Fatihə surəsini oxumayanın namazı qəbul deyildir»[1]

---

[1] əl-Bəqərə surəsi, 238-ci ayə.
[2] Səhihu-l-Buxari, 1117.
[3] Bax: «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 2/402.
[4] Səhihu-l-Buxari, 400; Səhih Muslim, 1616.
[5] Səhihu-l-Buxari, 1105; Səhih Müslim, 1208.
[6] Səhihu-l-Buxari, 757; Səhih Muslim, 883.

**4.** Rüku etmək;

Uca **Allah** buyurur:

يَآاَيُّهَا الَّذِينَ اٰمَنُوا ارْكَعُوا وَاسْجُدُوا

«**Ey iman gətirənlər!** [Namaz qıldıqda] **rüku edin, səcdəyə qapanın!**»[2]

**5.** Rukudan qalxıb dikəlmək;

Əbu Hureyrə (r.a) rəvayət edir ki, bir kişi Peyğəmbərə - **səllallahu aleyhi və səlləm** - dedi: «Mənə namaz qılmağ öyrət!» O dedi: «…sonra rükudan qalx və qamətini tam düzəlt…»[3]

**6.** Səcdə etmək;

Uca **Allah** buyurur:

يَآاَيُّهَا الَّذِينَ اٰمَنُوا ارْكَعُوا وَاسْجُدُوا

«**Ey iman gətirənlər!** [Namaz qıldıqda] **rüku edin, səcdəyə qapanın!**»[4]

İbn Abbas (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «Yeddi əza üzərinə: alın – əli ilə burnuna işarə etdi, – əllər, dizlər və ayaq barmaqları üzərinə səcdə etmək mənə əmr olundu»[5]

**7.** Səcdədən qalxıb oturmaq (yalnız iki səcdə arasında);

Əbu Hureyrə (r.a) rəvayət edir ki, bir kişi Peyğəmbərə - **səllallahu aleyhi və səlləm** - dedi: «Mənə namaz qılmağ öyrət!» O dedi: «…sonra səcdədən qalx otur və o vəziyyətdə rahat dur…»[6]

---

[1] Səhihu-l-Buxari, 756; Səhih Muslim, 872.
[2] əl-Həcc surəsi, 77-ci ayə.
[3] Səhihu-l-Buxari, 757; Səhih Muslim, 883.
[4] əl-Həcc surəsi, 77-ci ayə.
[5] Səhihu-l-l-Buxari, 809; Səhih Müslim, 1098.
[6] Səhihu-l-Buxari, 757; Səhih Muslim, 883.

**8.** Bu hərəkətləri (rahatlıqla) tələsmədən etmək;

Əbu Hureyrə (r.a) rəvayət edir ki, bir kişi Peyğəmbərə - **səllallahu aleyhi və səlləm** - dedi: «Mənə namaz qılmağ öyrət!» O dedi: «Namaz qılmağa durduğun zaman təkbir et, sonra Qurandan sənə müyəssər olanı oxu, sonra rüku et və o vəziyyətdə rahat dur, sonra rükudan qalx və qamətini tam düzəlt, sonra səcdə et və o vəziyyətdə rahat dur, sonra səcdədən qalx və o vəziyyətdə rahat dur, sonra bunların hamısını qalan rək'ətlərdə təkrar et!»[1]

**9.** Axırıncı rək'ətdə təşəhhüd demək üçün oturmaq;

**10.** Axırıncı rək'ətdə təşəhhüdü oxumaq;

Abdullah ibn Məsud (r.a) rəvayət edir ki, biz Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - arxasında namaz qıldığımız zaman belə deyərdik: «Salam olsun **Allaha**! Salam olsun filankəsə!»

Bir gün Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - bizə dedi: «Həqiqətən **Allah** Salamdır![2] Sizdən biriniz namazda oturduğu zaman desin! "Ət-təhiyyətu lilləhi və-s-sələvatu və-t-tayyibət, əs-sələmu aleykə eyyuhə-n-nəbiyyu və rahmətullahi və bərakətuhu, əs-sələmu aleynə və alə ibədilləhi-s-salihin, - bunu desə göydəki və yerdəki cəmi əməlisaleh bəndələrə salam vermiş olarsan - əşhədu ən lə iləhə illəllahu və əşhədu ənnə muhamməədən abduhu va rasuluhu"[3]

Duanın tərcüməsi: «Bütün alqışlar, dualar **Allaha**, bütün yaxşı işlər **Allah** üçün edilir. Ey Peyğəmbər, sənə salam olsun, **Allahın** mərhəməti və bərəkətləri yetişsin! Bizə və **Allahın** əməlisaleh bəndələrinə salam olsun! Mən şahidlik edirəm ki, **Allahdan** başqa məbud yoxdur və şahidlik edirəm ki, Məhəmməd Onun qulu və elçisidir.»

**11.** Bu hərəkətləri tərtiblə (ardıcıllıqla) etmək;

a) Uca **Allah** buyurur:

---

[1] Səhihu-l-Buxari, 757; Səhih Muslim, 883.
[2] Bu **Allahın** adlarından biridir. Bax: Şərh Səhih Muslim, 3/336.
[3] Səhihu-l-Buxari, 831; Səhih Muslim, 895.

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا ٱرْكَعُوا وَٱسْجُدُوا

«**Ey iman gətirənlər!** [Namaz qıldıqda] **rüku edin, səcdəyə qapanın!**»[1]

Cabir ibn Abdullahın (r.a) rəvayət etdiyi hədisdə Peyğəmğər - **səllallahu aleyhi və səlləm** - «…**Həqiqətən Səfa və Mərvə**[2] **Allahın əlamətlərindəndir**[3]**.** Mən də **Allahın** başladığından başlayıram**”** deyib Səfa dağına qalxdı…»[4] Deməli ayədə qeyd olunduğu kimi, (ardıcıllıqla) əvvəl rüku sonra isə səcdə etmək fərzdir.[5]

b) Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - namazlarını daima tərtiblə qılması.

Malik ibnu-l-Huveyris (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «…Mənim necə namaz qıldığımı görürsünüz, siz də elə namaz qılın!…»[6]

v) Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - səhabəyə tərtiblə namaz qılmağı öyrətməsi sonra həmişə belə namaz qılmağı ona əmr etməsi.

Əbu Hureyrə (r.a) rəvayət edir ki, bir kişi Peyğəmbərə - **səllallahu aleyhi və səlləm** - dedi: «Mənə namaz qılmağ öyrət!…»[7]

**12.** Salam ilə namazı tamamlamaq.

Əli ibn Əbu Talib (r.a) rəvayət edir ki, bir kişi Peyğəmbərə - **səllallahu aleyhi və səlləm** - dedi: «Təmizlik namazın açarı, təkbir onun qadağanı,[8] təslim də rüxsət verənidir.[9]»[1]

---

[1] əl-Həcc surəsi, 77-ci ayə.

[2] Bu Kəbənin yaxınlığında yerləşən kiçik dağlardır.

[3] Əl-Bəqərə surəsi. 158-ci ayə.

[4] Səhih Muslim, 2941.

[5] Bax: «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 2427.

[6] Səhihu-l-Buxari, 631; Səhih Muslim, 1533.

[7] Səhihu-l-Buxari, 757; Səhih Muslim, 883.

[8] Yəni, «**Allahu Əkbər**» deyib namaza başladıqdan sonra, namaza aid olmayan hər bir ifadə və ya hərəkəti etmək haramır.

[9] Yəni, salamları verib namazı bitirdikdən sonra, namaza aid olmayan hər bir ifadə və ya hərəkəti etmək caizdir.

Bu rüknlərdən hər hansı birini bilərəkdən tərk edənin namazı batil olur. Lakin səhvən bu rüknlərdən bəzilərini tərk edən tərk etdiyi rüknə görə yenidən bir rək'ət əlavə qılmalı və səhv səcdəsi etməlidir. Namazı çox tez qılan, yaxud ayaq üstə qılmaq imkanı ola-ola oturaq qılan və yaxud ilk təkbiri etməyən namazı yenidən tam qılmalıdır.

## ***Namazın vacibləri***

**1.** Ehram təkbirindən (namaza başladıqda edilən təkbirdən) başqa olan təkbirlər;

Əbu Hüreyrə (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «Həqiqətən, imam, namazı qıldırmaq (namaz qılanların ona itaət etməsi) üçün seçilib, ona müxalif olmayın! Təkbir[2] etdikdə təkbir edin!…»[3]

Bundan əlavə aşağdakı təkbirlər də mövcuddur:

a) İstisqa və bayram namazlarındakı əlavə təkbirlər (sünnədir);

b) Cənazə namazındakı təkbirlər (rükndür);

v) İmam rüku vəziyyətində olarkən ona çatan şəxsin təkbir etməsi (sünnədir);

**2.** «Səmi-**Allahu** limən həmidəh» demək;

Duanın tərcüməsi: Allah Ona həmd edəni eşitdi!

**3.** «Rabbənə və ləkəl həmd» demək;

Duanın tərcüməsi: Ey Rəbbimiz! Həmd yalnız Sənədir!

Əbu Hüreyrə (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «Həqiqətən, imam, namazı qıldırmaq (namazda olanların ona itaət etməsi) üçün seçilir, ona müxalif olmayın! Təkbir etdikdə təkbir, rüku etdikdə də rüku edin! "Səmi **Allahu** limən həmidəh" dedikdə "Rabbənə və ləkəl həmd" deyin!…»[4]

---

[1] «Müsnəd» 1/123; «Sünənu Əbi Davud» 2/229 – 614-cü hədis; İrvau-l-Ğalil, 2/8 – 301-ci hədis. **[Hədis səhihdir]**

[2] Yəni, «Allahu əkbər» demək.

[3] Səhihu-l-Buxari, 722, 734; Səhih Müslim, 920.

[4] Səhihu-l-Buxari, 722, 734; Səhih Müslim, 920.

İbn Əbi Əufə (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - rükudan qalxarkən deyərdi: «Səmi-**Allahu** limən həmidəh, **Allahummə** Rabbənə ləkəl həmd…»[1]

**4.** «Sübhanə Rabbiyə-l-Azım» demək;

Duanın tərcüməsi: Mənim Əzəmətli Rəbbim bütün nöqsanlardan uzaqdır!

**5.** «Sübhanə Rabbiyə-l-Ə'lə» demək;

Duanın tərcüməsi: Mənim Uca Rəbbim bütün nöqsanlardan uzaqdır!

Uqbə ibn Amir (r.a) rəvayət edir ki, **«Belə olduqda sən əzəmətli olan Rəbbinin adını pak və müqəddəs tutub şəninə təriflər de!** (Onu bütün eyb və nöqsanlardan uzaq bil!)**»[2] -** ayəsi nazil olduqda, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «Bunu rükularınızda deyin!», **«Ən Uca olan Rəbbinin adını pak və müqəddəs tutub şəninə təriflər de!** (Onu bütün eyb və nöqsanlardan uzaq bil!)**»[3] -** ayəsi nazil olduqda, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «Bunu səcdələrinizdə deyin!»[4]

Bu hədis, «Sübhanə Rabbiyə-l-Azım» və «Sübhanə Rabbiyə-l-Ə'lə» dualarının rüku və səcdədə deyilməsinin vacib olmağına dəlildir.[5]

**6.** «Rabbi-ğ-firli» demək;

Huzeyfə (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - iki səcdə arasında oturar və bu duanı oxuyardı: «Rabbi-ğ-firli, Rabbi-ğ-firli»[1]

---

[1] Səhih Müslim, 1067.

[2] əl-Vaqiə surəsi, 74, 96-cı ayələr.

[3] əl-Ə'la surəsi, 1-ci ayə.

[4] «Sünənu Əbi Davud» 3/85 – 864-cu hədis; «əl-Məcmu» 3/413. **[Hədis həsəndir]**

[5] Bax: «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 3/436-438; «Aunu-l-Məbud» 3/85.

Duanın tərcüməsi: Ey Rəbbim, məni bağışla!

**7.** Dörd və üç rək'ətli namazın ikinci rək'ətindən sonra oturmaq;

**8.** Dörd və üç rək'ətli namazın ikinci rək'ətindən sonra təşəhhüdü oxumaq.

Abdullah ibn Buheynə əl-Əsədi (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - Zöhr namazında təşəhhüdə oturmadan (üçüncü rək'ətə) qalxdı. Namazın tamamında, salamdan əvvəl təkbir edərək iki dəfə səhv səcdəsi etdi…»[2]

Bu vaciblərdən hər hansı birini bilərəkdən tərk edənin namazı batil olur. Lakin səhvən və ya unudaraq bu vaciblərdən birini tərk edən isə yalnız iki dəfə səhv səcdəsi etməlidir.

## ***Namazda bəyənilən əməllər (müstəhəblər)***

**1.** Sağ əl sol əlin üzərində olmaqla əlləri sinənin üzərinə (aşağı hissəsinə) qoymaq;

Vail (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - namaz qıldıqda sağ əli sol əlinin üstündə olmaqla əllərini sinəsinin üzərinə qoyardı…»[3]

**2.** İstiftah (Fatihə surəsindən qabaq oxunan dua);

Əbu Hüreyrə (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - təkbir edib (Fatihə surəsini) oxumazdan əvvəl bir az fasilə verərdi. Mən: «Ey Allahın elçisi, təkbirlə qiraət arasında verdiyin fasilədə nə oxuyursan?» – deyə soruşduqda o mənə dedi: "Allahummə bə'id bəyni və beynə xatayəyə kəmə bə'adtə bəynə-l-məşriqi və-l-məğrib. Allahummə nəqqini min xatayayə kəmə yunəqqə-s-səubu-l-

---

[1] «Sünənu Əbi Davud» 3/88 – 869-cu hədis; Sifətu salətu-n-Nəbiyyi - **səllallahu aleyhi və səlləmə** - səh: 153.

[2] Səhihu-l-Buxari, 1; Səhih Müslim, 1270.

[3] «Müsnəd» 4/317,318; İrvau-l-Ğalil, 2/68-69 – 352-ci hədis. **[Hədis səhihdir]**

əbyədu minə-d-dənəs. Allahummə-ğ-silni min xatayayə bil-mə'i və-s-səlci və-l-bəradi " duasını oxuyuram»[1]

Allahım, məşriqi[2] məğribdən[3] uzaqlaşdırdığın kimi, məni də xətalarımdan uzaqlaşdır! Allahım, ağ paltarın çirkabdan təmizləndiyi kimi məni də xətalarımdan təmizlə! **Allahım**, mənim xətalarımı su, qar və buz ilə təmizlə!

**3.** «əl-İstiazəni»[4] - oxumaq[5];

**"** əl-İstiazəni üç cür ifadə etmək olar:

***** «Əuzu billəhi minə-ş-şeytani-r-racim»[6]

Tərcüməsi: Lənətlənmiş şeytandan **Allaha** sığınıram!

***** «Əuzu billəhi-s-Səmiy'i-l-Alim minə-ş-şeytani-r-racim»

Tərcüməsi: Lənətlənmiş şeytandan hər şeyi eşidən və hər şeyi bilən **Allaha** sığınıram!

***** «Əuzu billəhi-s-Səmiy'i-l-Alim minə-ş-şeytani-r-racim min həmzihi və nəfxihi və nəfsihi»[7]

Tərcüməsi: Lənətlənmiş şeytanın vəsvəsəsindən, lovğalığından və sehrindən hər şeyi eşidən və hər şeyi bilən **Allaha** sığınıram![8]

**4.** «Bismilləhi-r-rahməni-r-rahim» demək;

Ənəs ibn Malik (r.a) deyir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** -**,** Əbu Bəkr (r.a), Ömər (r.a) və Osman (r.a) ilə namaz qıldım, onlardan heç birinin "bismilləhi-r-rahməni-r-rahim"i səslə oxuduğunu eşitmədim»[9]

---

[1] Səhihu -l-Buxari, 744; Səhih Müslim, 1353.

[2] Günçıxan.

[3] Günbatan.

[4] Yaradılanların şərindən **Allaha** pənah aparmaq.

[5] Uca **Allah** buyurur: - tərcüməsi - « **Quran oxumaq istədiyin zaman məlun şeytandan Allaha sığın!** »

[6] «ət-Təlxis» səh: 86, 87.

[7] «Musannəf ibn Əbi Şeybə» 1/92/1; İrvau-l-Ğalil, 2/53 – 342-ci hədis. **[Hədis səhihdir]**

[8] Bax: «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 3/71.

[9] Səhih Müslim, 888.

**Qeyd:** "bismilləhi-r-rahməni-r-rahim"i Fatihə surəsinin ayəsi hesab edənlər isə, onu Fatihə surəsi ilə birlikdə oxumağı rükn hesab edirlər.

Ummu Sələmə (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - "bismilləhi-r-rahməni-r-rahim"i namazda oxuyar və onu ayə hesab edərdi»[1]

**5.** Ayələri aramla oxumaq;

Ummu Sələmə (r.a) Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - necə Quran oxuduğu barədə soruşulduqda demişdir: «O, Quranı ayə-ayə oxuyardı:

"bismilləhi-r-rahməni-r-rahim!", "Əlhəmdulilləhi Rabbi-l-aləmin!"

"Ərrahməni-r-Rahim!" "Məliki yəumiddin!"[2]

**6.** «Amin» demək;

Əbu Hüreyrə (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «İmam "Amin" dedikdə, siz də birlikdə deyin! Kimin "Amin" deməsi mələklərin "Amin" deməsinə müvafiq olarsa onun keçmiş günahları bağışlanar»[3]

**7.** Fatihə surəsindən sonra oxunan hər hansı bir surə;

Ubadə ibnu-s-Samit (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «Fatihə surəsini oxumayanın namazı qəbul deyildir»[4]

İcmanın rəyinə görə namazda Fatihə surəsindən başqa surə oxumaq sünnədir.[5]

---

[1] «Müsnəd» 6/302; «Sünənu Əbi Davud» 4001-ci hədis; «Sünənu-l-Beyhəqi» 2/44; «Sünənu-t-Tirmizi» 2/152; «Sünənu-d-Daraqutni» 118; «Mustədraku-l-Hakim» 2/231-232; İrvau-l-Ğalil, 2/59-343-cü hədis. **[Hədis səhihdir]**

[2] ibn kəsirin təfsiri, 1/17; «əl-Məcmu», 3/333; İrvau-l-Ğalil, 2/60. **[Hədis səhihdir]**

[3] Səhihu-l-Buxari, 780; Səhih Müslim, 912.

[4] Səhihu-l-Buxari, 756; Səhih Muslim, 872.

[5] Bax: «əl-Məcmu» 3/389; Sifətu salətu-n-Nəbiyyi - **səllallahu aleyhi və səlləmə** - səh: 107-108; «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 3/103; İrvau-l-Ğalil 2/62-64.

Əbu Hüreyrə (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «Sizdən biriniz camaata namaz qıldırdıqda onu yüngülləşdirsin, çünki onların arasında zəif, xəstə və ehtiyac içində olanı var. Tək qıldığınız namazı isə istədiyiniz qədər uzadın»[1]

Əbu Qətadə əl-Ənsari (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - Zöhr namazının birinci iki rək'ətində "Fatihə" və başqa surələr oxuyar, birinci rək'əti uzun, ikincini isə qısa edərdi. Üçüncü və dördüncü rək'ətlərdə isə yalnız "Fatihə" surəsini oxuyardı….»[2]

* Surələri ardıcıl oxumaq vacib deyildir:

Huzeyfə ibnu-l-Yəmən (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - ilə gecə namazını qıldım. O, bir rək'ətdə «əl-Bəqərə» sonra «ən-Nisa» sonra da «Ali İmran» surələrini oxudu.[3]

* Ayələrin ardıcıl oxunması isə vacibdir. Onları əksinə, axırdan əvvələ, yaxud bir neçə ayə ortadan sonra əvvəldən, yaxud da başqa cür ardıcıllığı pozaraq oxumaq haramdır. Çünki nə Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - , nə səhabələr, nə də onların ardıcılları belə etməmişlər.

" Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - namazlarda oxuduğu surələr:

* **Fəcr namazında:** «əl-Vaqiə», «ət-Tur», «ət-Təkvir», «əz-Zəlzələ», «Qaf», «Əl-Fələq», «ən-Nas», «ər-Rum», «Yasin», «əl-Muminun», «əs-Saffat», «əs-Səcdə», «əl-İnsan»;

* **Fəcr namazının sünnətində:** «əl-Kafirun», «əl-İxlas»**;** «əl-Bəqərə, 136-cı ayə», «Ali İmran, 64-cü ayə», «Ali İmran, 52-ci ayə»;

* **Zöhr namazında:** «ət-Tariq», «əl-Leyl», əl-Buruc», «əl-İnşiqaq»;

* **Əsr namazında:** «ət-Tariq», «əl-Leyl», əl-Buruc», «əl-İnşiqaq»;

* **Məğrib namazında:** «əl-Ə'raf»; «ət-Tur», «əl-Mursələt», «əl-Ənfal», «ət-Tin»;

* **Məğrib namazının sünnətində:** «əl-Kafirun», «əl-İxlas»**;**

---

[1] Səhihu-l-Buxari, 803; Səhih Müslim, 1047.
[2] Səhihu-l-Buxari, 759; Səhih Müslim, 1012.
[3] Səhih Müslim, 1811.

*** İşa namazında:** «əş-Şəms», «əl-İnşiqaq», «ət-Tin»;

*** Gecə namazında:** «əl-Bəqərə», «ən-Nisa», «Ali İmran», «əz-Zumər», «əl-İsra», «əl-Muzzəmmil», «əl-Maidə» surəsinin 118-ci ayəsini səhərə qədər təkrar edib»;

*** Vitr namazında:** «əl-Ə'la» - «əl-Kafirun» - «əl-İxlas»; «Əl-Fələq», «ən-Nas», 100 ayə «ən-Nisa» surəsindən - «əz-Zəlzələ» - «əl-Kafirun»;

*** Cümə namazında:** «əl-Cumuə» - «əl Munafiqun»; «əl-Ə'la» - «əl-Ğaşiyə»;

*** Bayram namazında:** «əl-Ə'la» - «əl-Ğaşiyə»; «Qaf» - «əl-Qəmər»" [1]

**Qeyd:** İstənilən namazda istənilən surəni (bu və ya digər surələri) oxumaq üçün heç bir məhdudiyyət yoxdur.

**8.** Səsli namazlarda səslə oxumaq;

Səslə qılınan namazlar aşağıdakılardır:

* Məğrib və İşanın əvvəlki iki rək'əti, Fəcr, Cümə, İstisqa, Kusuf (Xusuf), bayram və gecə namazları.[2]

Səssiz[3] (dil və dodaqları tərpətmək şərtilə) qılınan namazlar aşağıdakılardır:

* Məğrib və İşanın üçüncü və dördüncü rək'ətləri, Zöhr, Əsr, nafilə və gecə namazları.[4]

Əbu Mə'mər rəvayət edir ki, «mən Xabbəb ibnu-l-Ərata (r.a) dedim: Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - Zöhr və Əsr namazlarında surə oxuyardımı?» O, «Bəli» deyə cavab verdi. Mən ondan «siz onun

---

[1] Sifətu salətu-n-Nəbiyyi - **səllallahu aleyhi və səlləmə** - səh: 109-123.

[2] Bax: Səhihu-l-Buxari, 765-767, 773, 774, 1024, 1065, 1066; Səhih Muslim, 2023-cü hədislərə.

[3] Səssiz deyildikdə yalnız qiyamda oxunan surələrin və «amin»-in səslə oxunmaması qəsd olunur. Təkbirlər, «səmi **Allahu** limən həmidəh» və salamlar isə səslə deyilir. Səssiz qılınan namazlar isə (İstisqa, Vitr və Təravih namazlarından başqa olan) nafilə namazlarıdır.

[4] Bax: Səhihu-l-Buxari, 762, 765, 766, 767-ci hədislərə.

surə oxuduğunu necə təyin edirdiniz?» deyə soruşduqda o, «saqqalının tərpənməsindən» deyə cavab verdi.[1]

**9.** «Sübhanə Rabbiyə-l-Azım» duasını bir dəfədən artıq oxumaq;

əl-Bəra ibn Azib (r.a) rəvayət edir ki, «Mən Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - qıldığı namaza diqqət etdim və qiyamda[2], rükuda, rükudan sonra dikəldikdə, səcdədə, iki səcdə arasında və sonuncu təşəhhüddə olduğu (sərf etdiyi) zamanlar bərabər olmağa yaxın idi»[3]

Rükunun uzadılması «Sübhanə Rabbiyə-l-Azım» duasını bir dəfədən artıq oxumağa rüxsət verir.[4]

**10.** Rükuda bu duadan başqa oxunan dualar;

Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - "**Allahın köməyi və zəfər gəldikdə; insanların dəstə-dəstə Allahın dininə daxil olduğunu gördüyün zaman; Rəbbini həmd-səna ilə təqdis et və Ondan bağışlanmağını dilə; Həqiqətən, O, tövbələri qəbul edəndir**" («ən-Nəsr») surəsi nazil olduqdan sonra hər namazında bu duanı oxuyardı: "Subhənəkə Allahummə Rabbənə va bihəmdikə, Allahummə-ğ-firli"»[5]

Duanın tərcüməsi: «Ey bütün nöqsanlardan uzaq olan Allahım, ey Rəbbim, Sənə həmd olsun! **Allahım**, məni bağışla!»

Başqa rəvayətdə: «Peyğəmbər (s.ə.s) rüku və səcdədə bu duanı çox edərdi: "Subhənəkə Allahummə Rabbənə va bihəmdikə, Allahummə-ğ-firli»[6]

Rükuda bu duadan başqa dualar da oxumaq olar.

---

[1] Səhihu-l-Buxari, 761.
[2] Ayaq üstə Fatihə və s. surələrin oxunduğu hal.
[3] Səhih Müslim, 1057.
[4] Sifətu salətu-n-Nəbiyyi - **səllallahu aleyhi və səlləmə** - səh: 132.
[5] Səhihu-l-Buxari, 794; Səhih Müslim, 1087.
[6] Səhih Müslim, 1085.

**11.** Əlləri qaldırmaq (təkbir edərək namaza daxil olduqda, rüku etdikdə, rükudan və bir də birinci təşəhhüddən sonra üçüncü rək'ətə qalxdıqda);

Abdullah ibn Ömər rəvayət edir ki; «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - namaz qılmağa başladıqda, təkbir edib rüku etdikdə və «Səmi-**Allahu** limən həmidəh» deyib rükudan qalxdıqda əllərini çiyinləri bərabərinə qaldırardı. O, səcdədə (səcdəyə qapandıqdı və səcdədən qalxdıqda) belə etməzdi.»[1]

Başqa rəvayətdə: «…əllərini qulaqları bərabərinə qaldırardı…»[2]

**12.** «Sübhanə Rabbiyə-l-Ə'lə» duasını bir dəfədən artıq oxumaq;

Səcdənin uzadılması «Sübhanə Rabbiyə-l-Ə'lə» duasını bir dəfədən artıq oxumağa rüxsət verir.[3]

**13.** Səcdədə «Sübhanə Rabbiyə-l-Ə'lə» **-** dən başqa oxunan dualar;

Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - "**Allahın köməyi və zəfər gəldikdə; insanların dəstə-dəstə Allahın dininə daxil olduğunu gördüyün zaman; Rəbbini həmd-səna ilə təqdis et və Ondan bağışlanmağını dilə; Həqiqətən, O, tövbələri qəbul edəndir**" («ən-Nəsr») surəsi nazil olduqdan sonra hər namazında bu duanı oxuyardı: "Subhənəkə Allahummə Rabbənə va bihəmdikə, Allahummə-ğ-firli"»[4]

Duanın tərcüməsi: «Ey bütün nöqsanlardan uzaq olan Allahım, ey Rəbbim, Sənə həmd olsun! Allahım, məni bağışla!»

Başqa rəvayətdə: «Peyğəmbər (s.ə.s) rüku və səcdədə bu duanı çox edərdi: "Subhənəkə Allahummə Rabbənə va bihəmdikə, Allahummə-ğ-firli» [5]

Səcdədə bu duadan başqa dualarda oxumaq olar.

**14.** Sonuncu təşəhhüddə salavatdan sonra oxunan dualar;

---

[1] Səhihu-l-Buxari, 736; Səhih Müslim, 860.
[2] Səhih Müslim, 863.
[3] (Bax: 6-cı bənddəki hədisə).
[4] Səhihu-l-Buxari, 794; Səhih Müslim, 1087.
[5] Səhih Müslim, 1085.

Əbu Hüreyrə (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - namazda dua edib deyərdi: "Allahummə inni əuzu bikə mən azəbi-l-qabr va min azəbi-n-nar va min fitnəti-l-məhyə va-l-məməti va min fitnəti-l-məsihi-d-dəccal"»[1]

Duanın tərcüməsi: «Allahım! Həqiqətən mən qəbr və cəhənnəm əzabından, həyatın və ölümün fitnəsindən və məsihi-d-dəccalın fitnəsinin şərindən Sənə sığınıram!».

Başqa rəvayətdə: «Təşəhhüddə dörd şeydən Allaha sığının: "Allahummə inni əuzu bikə min azəbi cəhənnəm va əuzu bikə min azəbi-l-qabr va əuzu bikə min fitnəti-l-məhyə va-l-məməti va əuzu bikə min şərri fitnəti-l-məsihi-d-dəccal"»[2]

**15.** Birinci rək'ətin ikinci rək'ətdən, ikinci rək'ətin üçüncü rək'ətdən, üçüncü rək'ətin də dördüncü rək'ətdən uzun olması;

Əbu Qətadə əl-Ənsari (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - Zöhr namazının birinci iki rək'ətində (hər rək'ətdə) "Fatihə" və başqa surələr oxuyar, birinci rək'əti uzun, ikincini isə qısa edərdi. Üçüncü və dördüncü rək'ətlərdə isə yalnız "Fatihə" surəsini oxuyardı. Həmçinin, sübh namazının birinci rək'ətini uzadar, ikinci rək'ətini isə qısa edərdi»[3]

**16.** Təşəhhüddə və ikinci, dördüncü rək'ətlərə qalxmazdan əvvəl sol ayaq üzərində oturmaq və sağ ayağın barmaqlarını qibləyə tərəf yönəltmək;

Aişə (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - … (Təşəhhüdü oxuduğu zaman) sol ayağının üzərində oturub sağ ayağının barmaqlarını qibləyə tərəf yönəldərdi…»[4]

**17.** Təşəhhüddə işarə (şəhadət) barmağını qibləyə tərəf yönəltmək və ya onu tərpətmək;

---

[1] Səhihu-l-Buxari, 1377.
[2] Səhih Müslim, 1324.
[3] Səhihu-l-Buxari, 759; Səhih Müslim, 1012.
[4] Səhih Müslim, 1110.

"Abdullah ibn Ömər rəvayət edir ki; «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - Təşəhhüddə barmağı ilə işarə etdikdə baş barmağını orta barmağının üzərinə qoyardı» hərdən də «bu iki barmağı dairə şəklində tutardı» həmçinin «dua edərkən şəhadət barmağını tərpədərdi»"[1]

**18.** «Rabbi-ğ-firli» duasını bir dəfədən artıq oxumaq;

Huzeyfə (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - iki səcdə arasında oturar və bu duanı oxuyardı: «Rabbi-ğ-firli, Rabbi-ğ-firli»[2]

**19.** Peyğəmbərə - **səllallahu aleyhi və səlləm** - salavat gətirmək;[3]

Əbdürrəhman ibn Əbi Leylə deyir ki, Kəb ibn Ucra (r.a) ilə rastlaşdıq və o mənə: «İstəyirsən sənə hədiyyə verim?» deyib rəvayət etdi ki, bir dəfə Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - bizim yanımıza gəldi və biz ona dedik: «Ey **Allahın** elçisi! Sənə salam verməyi artıq öyrəndik. İndi isə sənə necə salavat etməyi bizə öyrət». O dedi: «Deyin: "Allahummə salli alə Muhammədin va alə əli Muhamməd, kəmə salleytə alə İbrahimə va alə əli İbrahim, innəkə həmidun məcid, va barik alə Muhammədin va alə əli Muhamməd, kəmə bəraktə alə İbrahimə va alə əli İbrahim, innəkə həmidun məcid"»[4]

Duanın tərcüməsi: «Allahım, Məhəmmədə və onun ailəsinə də İbrahimə və onun ailəsinə xeyir-dua verdiyin kimi xeyir-dua ver! Sən, həqiqətən, alqışlara və həmdlərə layiqsən. Məhəmmədə və onun ailəsinə də İbrahimə və onun ailəsinə bərəkət verdiyin kimi bərəkət ver! Sən, həqiqətən, alqışlara və həmdlərə layiqsən».

**20.** Səcdə yerinə baxmaq.

Əbu Hureyrə (r.a) rəvayət edir ki, **«O kəslər ki, namazlarında** (hər şeyi unudaraq ruhən və cismən yalnız **Allaha**) **müti olub** (**Ona**)

---

[1] Sifətu salətu-n-Nəbiyyi - **səllallahu aleyhi və səlləmə** - səh: 158.

[2] «Sünənu Əbi Davud» 3/88 – 869-cu hədis; Sifətu salətu-n-Nəbiyyi - **səllallahu aleyhi və səlləmə** - səh: 153. **[Hədis həsəndir]**

[3] Bax: «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 3/425.

[4] Səhihu-l-Buxari, 6357; Müslim, 907.

**boyun əyərlər!** (**Allahın** qarşısında kiçilərlər!)**»**[1] ayəsi nazil olduqdan sonra Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - namaz qıldıqda başını aşağı dikərdi (səcdə yerinə baxardı)[2]

Bu sünnələrin birini tərk etmək namazı batil etmir və səhv səcdəsi etmək də lazım gəlmir, yalnız namaz qılan bunları etməklə əlavə savab qazanmır.

## ***Namazı batil edən amillər***

**1.** Dindən dönmək (**Allah** bizi və sizi xüsusilə bundan qorusun!);

Uca **Allah** buyurur:

وَمَن يَرْتَدِدْ مِنكُمْ عَن دِينِهِ فَيَمُتْ وَهُوَ كَافِرٌ فَأُولَٰئِكَ حَبِطَتْ أَعْمَالُهُمْ فِي الدُّنْيَا وَالْآخِرَةِ وَأُولَٰئِكَ أَصْحَابُ النَّارِ هُمْ فِيهَا خَالِدُونَ ﴿٢١٧﴾

**«Sizdən hər kəs öz dinindən dönüb kafir olaraq ölərsə, belə şəxsin bütün əməlləri dünya və axirətdə heçə gedər. Onlar cəhənnəmlikdirlər və orada əbədi qalacaqlar!»**[3]

Uca **Allah** buyurur:

إِنَّ الْمُنَافِقِينَ يُخَادِعُونَ اللَّهَ وَهُوَ خَادِعُهُمْ وَإِذَا قَامُوا إِلَى الصَّلَاةِ قَامُوا كُسَالَىٰ يُرَاءُونَ النَّاسَ وَلَا يَذْكُرُونَ اللَّهَ إِلَّا قَلِيلًا ﴿١٤٢﴾

**«Münafiqlər Allahı aldatmağa çalışırlar. Halbuki əslində Allah onları aldadır. Onlar namaza durduqları zaman** (yerlərindən) **tənbəlliklə** (könülsüz) **qalxar, özlərini** (yalandan) **xalqa göstərər və Allahı olduqca az yad edərlər.»**[4]

إِنَّ الْمُنَافِقِينَ فِي الدَّرْكِ الْأَسْفَلِ مِنَ النَّارِ وَلَن تَجِدَ لَهُمْ نَصِيرًا ﴿١٤٥﴾

---

[1] əl-Muminun surəsi, 2-ci ayə.
[2] «Mustədraku-l-Hakim» 2/393; İrvau-l-Ğalil 2/72. **[Hədis səhih, mürsəldir]**
[3] əl-Bəqərə surəsi, 217-ci ayə.
[4] ən-Nisa surəsi, 142-ci ayə.

**«(Ya Məhəmməd!) Əlbəttə, münafiqlərin yeri Cəhənnəmin ən aşağı təbəqəsindədir. Sən heç vaxt onlara yardım edən tapmazsan!»**[1]

**2.** Rükn, vacib və şərtlərdən hər hansı birini qəsdən tərk etmək; Bax: Ərkan, vacib və şərtlərin əvvəldə qeyd olunmuş nəticələrinə!

**3.** Namaz əsnasında bilərəkdən artıq (namaza aid olmayan) danışmaq və ya hərəkət etmək;[2]

Zeyd ibn Ərqam (r.a) rəvayət edir ki, «Biz İslamın əvvəlində namaz əsnasında danışardıq. Bu hal («əl-Bəqərə» surəsi, 238-ci) ayə nazil olana qədər davam etdi. (Bu ayədə Uca Allah buyurur):



**«Namazlara, xüsusilə də orta namaza (əsr namazı) riayət edin və Allaha itaət etmək üçün ayağa qalxın və sükutla namaz qılın!»**. Beləliklə, sükutla namaz qılmaq və namaz əsnasında danışmamaq bizə əmr olundu»[3]

" Namaz əsnasında edilən hərəkət yalnız üç şərtlə namazı batil edir:

a) Uzun müddət edildikdə;

b) Zərurət olmadıqda;

v) Ardıcıl olduqda. "[4]

**4.** Bilərəkdən rükuların, səcdələrin, qiyamların (ayaq üstdə duruşların) və qüudularının (oturuşların) sayını artırmaq;

Sünnəyə müxalif olan ibadət qəbul olunmur.

---

[1] ən-Nisa surəsi, 145-ci ayə.
[2] «Namazla əlaqəli mühüm fətvalar» səh: 107.
[3] Səhihu-l-Buxari, 4534; SəhihMüslim, 1203.
[4] Bax: «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 3/352.

Aişədən (r.a) rəvayət olunan hədisdə Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - demişdir: «Bizim etdiyimiz ibadətlərə yenilik əlavə edən kimsənin əlavəsi rədd olunur»[1]

**5.** Surələri oxuduqda bilərəkdən ya hərfləri, ya kəlmələri, ya da ayələri düz oxumamaq. Bu, **Allah** tərəfindən nazil olan tərtibin bilərəkdən pozulduğuna görədir.[2]

**6.** Bilərəkdən namaz əsnasında bir şey yemək və ya içmək;

" Əksər islam alimlərinin rəyinə görə bilərəkdən namaz əsnasında yemək, içmək namazı batil edir."[3]

**7.** Qəh-qəhə ilə gülüş (təbəssüm müstəsnadır).

Qəh-qəhə, namaz əsnasında (namazdan kənar) danışmağa bənzədiyinə görə namazı batil edir. Həmçinin namazda olan xuşunu (**Allah** qorxusunu) azaldır və namazı oyun-oyuncağa çevirir.[4]

"Bəzi İslam alimləri bütün dəlilləri nəzərə alıb namazda olan hərəkətləri dörd qismə bölmüşlər:

1) Namazı batil edən, haram sayılan hərəkətlər. Məs: danışmaq, və s.

2) Namazı batil etməyən, lakin məkruh (bəyənilməyən) sayılan hərəkətlər. Məs: yuxarı baxmaq, əlləri belə qoymaq və s.

3) Ehtiyac ucundan edilən (namazı batil etməyən) hərəkətlər. Məs: bədənin hər hansı bir yerini qaşımaq, gözləri yummaq, öskürmək, asqırmaq və s.

4) Vacib olan hərəkətlər. Məs: boş cərgələri doldurmaq, «Sübhənallah» deməklə imama səhv etdiyini xatırlatmaq və s."[5]

---

[1] Səhih Müslim, 4467.

[2] Bax: «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 3/110.

[3] Bax: «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 3/484-486.

[4] Bax: «əl-İxtiyarat» səh: 59; «Məcmu fətava» 22/614; «əş-Şərhu-l- Mumti alə Zadu-l-Mustəqnəi» 3/497.

[5] «Teysiru-l-alləm», 1/207-208.

**8.** Biləərəkdən tələffüz olunan rükn[1] və vacibləri[2] dili tərpətmədən (qəlbbən keçitrməklə) yerinə yetirmək.[3]

**9.** Təyəmmüm etdikdən sonra namaz qılınan vaxt su tapılsa.[4]

## ***Namazda bəyənilməyən əməllər (məkruhlar)***

**1.** Yuxarı baxmaq;

Cabir ibn Səmura (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «Namaz əsnasında göyə (yuxarı) nəzər salanlar (etdikləri əməldən) çəkinsinlər!…»[5]

**2.** Səbəbsiz yerə başı döndərmək;

Aişə (r.a) rəvayət edir ki, «Mən Peyğəmbərdən - **səllallahu aleyhi və səlləm** - namazda dönmək barəsində soruşdum? O dedi: "Bu (başı ora-bura döndərmək) namazda olan oğurluqdur ki, şeytan da ondan istifadə edib bəndənin namazından (savabını) oğurlayır."»[6]

**3.** Namazdan yayındıran şeylərə baxmaq;

Aişə (r.a) rəvayət edir ki, «Bir dəfə Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - üzərində müxtəlif rənglərdən ibarət xətlər olan paltarda namaz qıldı və o xətlərə nəzər saldı. Namazı qılıb qurtardıqdan sonra dedi: "Aparın bu paltarı verin Əbu Cəhmə[7], mənə də sadə (üzərində fikri yayındıra biləcək əlamət olmayan) bir ənbicaniyyə[8] gətirin. Həqiqətən, bu, məni namazdan yayındırdı"»[9]

---

[1] İlk təkbir, Fatihə surəsi, sonuncu təşəhhüd, salamlar.

[2] İlk təkbirindən sonrakı təkbirlər, «Səmi-**Allahu** limən həmidəh», «Rabbənə və ləkəl həmd», «Sübhanə Rabbiyə-l-Azım», «Sübhanə Rabbiyə-l-Ə'lə», «Rabbi-ğ-firli», ilk təşəhhüd.

[3] Bax: «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 3/23-25.

[4] Bax: əl-Maidə surəsi, 6-cı ayə.

[5] Səhih Müslim, 965, 966.

[6] Səhihu-l-Buxari, 751.

[7] Adı: Übeydullah ibn Huzeyfə əl-Quraşi əl-Adəvi (r.a).

[8] Yundan hazırlanmış paltar.

[9] Səhihu-l-Buxari, 373; Səhih Müslim, 1238.

**4.** Əlləri belə qoymaq;

Əbu Hureyrə (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - əllər beldə namaz qılmağı qadağan etdi.[1]

**5.** Səcdədə dirsəkləri yerə qoymaq;

Ənəs ibn Malik (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: "Səcdədə bədəninizi şax tutun və itin dirsəkləndiyi kimi dirsəklənməyin[2]»[3]

Aişə (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - … (Təşəhhüdü oxuduğu zaman) sol ayağının üzərində oturub sağ ayağının barmaqlarını qibləyə tərəf yönəldər və şeytan oturuşundan[4] (səhabələrini) çəkindirərdi. Həmçinin, heyvan oturuşundan[5] da (onları) çəkindirərdi…»[6]

**6.** Gözləri yummaq;

" Bu hərəkət kitab əhlinin əməlindən olduğu üçün müsəlmanlara belə etmək bəyənilmir. Lakin qeyd etmək lazımdır ki, namaz qılanın önündə onu namazdan yayındıra biləcək hər hansı bir şey olarsa o zaman gözləri yummaq caizdir. "[7]

**7.** Səbəbsiz yerə namazı batil etməyən artıq hərəkətlər etmək (qaşınmaq, tərpənmək və s.);

Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - nafilə namazı qılarkən mən qapını döydüm və o qiblə istiqamətində yerləşən qapını açdı sonra namaz qıldığı yerə qayıtdı.»[8]

---

1 Səhihu-l-Buxari, 1219,1220; Səhih Müslim, 1218.

2 Səcdə zamanı dirsəkləri yerə qoymaq.

3 Səhihu-l-Buxari, 822; Səhih Müslim, 1102.

4 Ayaqları yana çəkib arxanı yerə vurmaq.

5 Səcdə etdikdə dirsəkləri yerə qoymaq.

6 Səhih Müslim, 1110.

7 «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 3/316-317.

8 «Sünənu Əbi Davud» 3/134 – 918-ci hədis; «Sünənu-n-Nəsai» 3/11 – 1206-cı hədis; İrvau-l-Ğalil, 2/108 – 386-cı hədis **[Hədis həsəndir].**

Bu hədisdən belə nəticə çıxartmaq olar ki, namaz əsnasında yalnız zəruri halda tərpənmək (telefonu söndürmək, qaşınmaq, öskürmək və s.) olar.

**8.** Ortalığa yemək qoyulduğu zaman;

Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: "Şam yeməyi süfrəyə qoyulduğu zaman iqamə verilərsə, əvvəlcə yeməyi yeyin! (Sonra namaz qılın)"»[1]

" Qeyd etmək lazımdır ki, bu halda aşağıdakı şərtlərə riayət etmək lazımdır:

a) Yeməyin süfrədə hazır olması;

b) Nəfsin ehtirasla ona meyl etməsi;

v) Nəfsi çəkən şəxsin onu yeməyə qadir olması.

Deməli, əgər insan toxdursa, yaxud oruc tutubsa, yaxud da yemək çox istidirsə bu halda əksinə namazı gecikdirmək bəyənilmir. "[2]

**9.** Eyni rək'ətdə Fatihəni təkrar oxumaq;

"Peyğəmbərdən - **səllallahu aleyhi və səlləm** - eyni rək'ətdə Fatihə surəsini təkrar oxuduğu rəvayət olunmadığı üçün bunu etmək bəyənilmir."

**10.** Sidiyi, havanı və s. zorla saxlayaraq ayaqyoluna getməmək.

Aişə (r.a) rəvayət edir ki, «Mən Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - : "Yemək gətirildiyi zaman, həmçinin öndən və arxadan çıxanı[3] dəf edərək (saxlayaraq) namaz qılınmamalıdır" – dediyini eşitdim»[4]

**11.** Namazdan qabaq pencəyin və ya köynəyin qollarını çırmalamaq;

İbn Abbas (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «Yeddi əza üzərinə səcdə etmək mənə əmr olundu, saçı[5] və libası çırmalamaq isə qadağan olundu.»»[1]

---

[1] Səhihu-l-Buxari, 5465; Səhih Müslim, 1241.
[2] «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 3/328-329.
[3] Sidik və nəcis.
[4] Səhih Müslim, 1246.
[5] Saçları hörməklə, yaxud başqa üsulla onları yığmaq.

**12.** Çiyni açıq namaz qılmaq;

Əbu Hüreyrə (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: "Sizdən biriniz çiynini örtməyən bir paltarda namaz qılmasın!"»[2]

Qeyd etmək lazımdır ki, qəsdən, bilərəkdən çiyni örtməyən bir paltarda qılınan namaz batildir.[3]

**13.** Üzərində müxtəlif heyvan, quş, insan və s. şəkli olan paltarda, habelə bu növ şəkillərin qarşısında və ya üstündə namaz qılmaq;

Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - zövcəsi Ummu Sələmə (r.a) və Ummu Həbibə (r.a) Həbəşistandakı Mariya adlı kilsənin gözəl olduğunu və içərisindəki şəkilləri müşahidə etməsini ölümqabağı ona xəbər verdilər, O, başını qaldırıb dedi: "Onlar vəfat etmiş saleh insanın qəbrinin üzərində məscid tikir, sonra da içərisində onun şəklini təsvir edirlər. Onlar Allah yanında məxluqatın ən şərlisi hesab olunurlar»[4]

Bax: 3-cü bənddəki Aişənin (r.a) rəvayət etdiyi hədisə.

**14.** Namaz qılanın qabağında sütrənin[5] olmaması;

Əbu Səid əl-Xudri (r.a) rəvayət edir ki, «Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - : "Sizdən biriniz namaz qıldığı zaman önünə sütrə qoysun! Bundan sonra isə önündən keçmək istəyəni əli ilə dəf etsin, keçməyə cəhd edərsə ona müqavimət göstərsin, çünki artıq o, şeytandır" – dediyini eşitdim»[6]

**15.** Niyyəti ürəkdə deyil, dillə ifadə etmək;

---

[1] Səhihu-l-l-Buxari, 809; Səhih Müslim, 1096, 1097, 1098.

[2] Səhihu-l-Buxari, 359; Səhih Müslim, 1151.

[3] «Namazla əlaqəli mühüm fətvalar» səh: 6.

[4] Səhihu-l-Buxari, 1341; Səhih Müslim, 1181.

[5] Təqribən dirsək hündürlüyündə olan ağac və ya ona bənzər əşyanın qoyulması.

[6] Səhihu-l-Buxari, 509; Səhih Müslim, 1128.

Peyğəmbərdən - **səllallahu aleyhi və səlləm** - və səhabələrdən niyyəti dillə tələffüz etdikləri varid olmamışdır. Çünki niyyətin yeri qəlbdir.[1] Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - yalnız həcc və ümrə ziyarətlərində niyyəti dillə tələffüz etmişdir.

**16.** Rükuda olarkən belin və qolların düz olmaması;

Aişə (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - təkbir və qiraətlə ("əl-həmdu lillahi Rabbi-l-aləmin" deməklə) namaza başlayardı. Rüku etdikdə başını düz tutar, yuxarı və aşağı əyməzdi…»[2]

**17.** Sıraların tam şəkildə düzəldilməməsi, namaz qılanlar arasında boşluğun olması;

Ənəs ibn Malik (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «Cərgələrinizi düzəldin! Həqiqətən, cərgələrin düz olması namazın tamam olmasına işarədir»[3]

**18.** Səcdə zamanı baş və dizlər, dirsəklər və bel arasında məsafə (boşluq) qoymamaq.

Abdullah ibn Malik (r.a) – İbn Büheynə[4] – rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - səcdə etdikdə qollarını o qədər aralayardı ki, qoltuğunun altının ağlığı görünərdi»[5]

**19.** Camaat namazında imamdan qabaq hərəkət etmək.

Əbu Hüreyrə (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «İmamdan əvvəl başını (səcdədən) qaldıran qorxmur ki, **Allah** da onun başını – və ya surətini uzunqulağın surətinə çevirər?»[6]

**20.** Rüku və səcdədə Quran oxumaq.

---

[1] «Namazla əlaqəli mühüm fətvalar» səh: 11.
[2] Səhih Müslim, 1110.
[3] Səhihu-l-Buxari, 723; Səhih Müslim, 974.
[4] Bu ləqəblə məşhurdur.
[5] Səhihu-l-Buxari, 390; Səhih Müslim, 1105.
[6] Səhihu-l-Buxari, 691; Səhih Müslim, 962, 963.

İbn Abbas (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «…Həqiqətən rüku və səcdədə Quran oxumaq mənə qadağan edildi…»[1]

**21.** Məsciddə yer seçib daima yalnız o yerdə namaz qılmaq.

Abdurrahmən ibn Şibl (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - «qarğa kimi dimdikləməyi,[2] heyvan kimi yerə yayılmağı,[3] dəvənin özünə daimi yer seçdiyi kimi məsciddə yer seçməyi» qadağan etdi.[4]

Bu məkruhlardan birini etmək namazı batil etmir və səhv səcdəsi etmək də lazım gəlmir, yalnız namaz qılan əlavə savab qazanmır və hətta bəzilərinə görə günah da qazanır.

## ***Namazın qılınması üçün qadağan olunmuş yerlər***[5]

**1.** Murdar yerlər;

Uca **Allah** buyurur:

وَعَهِدْنَا إِلَى إِبْرَاهِيمَ وَإِسْمَاعِيلَ أَنْ طَهِّرَا بَيْتِيَ لِلطَّائِفِينَ وَالْعَاكِفِينَ
وَالرُّكَّعِ السُّجُودِ ﴿١٢٥﴾

**«İbrahimə və İsmailə: " Evimi** [Kəbəni] **təvaf edənlər, orada qalıb həmişə ibadətdə olanlar, rüku və səcdə ilə namaz qılanlar üçün** [bütlərdən və nəcasətdən] **təmizləyin! " – deyə tövsiyə etdik.»**[6]

---

[1] Səhih Müslim, 1074.

[2] Rüku və səcdəni çox tez etmək.

[3] Səcdədə dirsəkləri yerə qoymaq.

[4] «Sünənu Əbi Davud» 3/73 – 857-ci hədis; «Silsilətu-l-əhadisi-s-sahihə» 3/156 – 1168-ci hədis.

[5] «Təmamu-l-Minnə» səh:297-299.

[6] əl-Bəqərə surəsi, 125-ci ayə.

**2.** Qəbrstanlıqda (meyit dəfn olunmuş yerdə), qəbrə üz tutmaqla və ya onun üstündə namaz qılmaq (cənazə namazı müstəsnadır);

Əbu Mərsəd əl-Ğanəvi (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «Qəbrlərin üstündə oturmayın və onlara tərəf namaz qılmayın!»[1]

Abdullah ibn Abbas (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - meyit dəfn olunduqdan sonra qəbrin önündə dayanıb dörd təkbirli (rüku və səcdəsiz) namaz qıldı»[2]

İbn Ömər (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «Evlərinizdə namaz qılın və onları məqbərəyə döndərməyin!»[3]

Əbu Hureyrə (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «Evlərinizi qəbirstanlığa döndərməyin, həqiqətən şeytan "əl-Bəqərə" surəsi oxunan evdən qaçır!»[4]

**3.** Hamam və tualetdə;

Əbu Səid əl-Xudri (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «Hamam və məqbərədən başqa, yer üzünün hər tərəfi məsciddir.»[5]

**4.** Dəvə saxlanılan yerdə;

Cabir ibn Səmura (r.a) rəvayət edir ki, bir kişi gəlib Peyğəmbərdən - **səllallahu aleyhi və səlləm** - soruşdu: «…Dəvənin saxlandığı yerlərdə namaz qıla bilərəmmi? O dedi: Xeyr!»[6]

## ***Azan***

**[Allahu Əkbər] – Allah** ən böyükdür! – dörd dəfə;

---

[1] Səhih Müslim, 2247.
[2] Səhih Müslim, 2208.
[3] Səhih Müslim, 1817.
[4] Səhih Müslim, 1821.
[5] Əbu Davudun «Sünən» əsəri, 2/112 – 489-ci hədis.
[6] «Müsnəd» 5/86, 88, 93, 100; Səhih Muslim, 800; İrvau-l-Ğalil, 1/152 – 118-ci; hədis. **[Hədis səhihdir]**

**[Əşhədu ən lə iləhə illəllah] –** Mən şahidlik edirəm ki, **Allahdan** başqa heç bir mə'bud yoxdur! – iki dəfə;

**[Əşhədu ənnə Muhammədən rasulullah] –** Mən şahidlik edirəm ki, Məhəmməd **Allahın** elçisidir! – iki dəfə;

**[Hayyə alə-s-saləh] –** Namaza tələsin! – iki dəfə;

**[Hayyə alə-l-fələh] –** Səadətə qovuşmağa tələsin! – iki dəfə;

**[Allahu Əkbər] –** iki dəfə;

**[Lə iləhə illəllah] –** bir dəfə.

## ***İqamə***

**[Allahu Əkbər] –** iki dəfə;

**[Əşhədu ən lə iləhə illəllah] –** bir dəfə;

**[Əşhədu ənnə Muhammədən rasulullah] –** bir dəfə;

**[Hayyə alə-s-saləh] –** bir dəfə;

**[Hayyə alə-l-fələh] –** bir dəfə;

**[Qad qamətis salət] –** Artıq namaz başladı! – iki dəfə;

**[Allahu Əkbər] –** iki dəfə;

**[Lə iləhə illəllah] –** bir dəfə.

Azan və iqamə demək camaat üçün istənilən halda (səfərdə, evdə, namazın qəzasını qıldıqda) fardu-l-kifayədir,[1] tək namaz qılan şəxs üçün isə müstəhəbdir. Qadınlar üçün isə nə azan nə də iqamə vermək vacib deyildir. Lakin səslərini çox uca qaldırmadan bunu etmələri müstəhəbdir. Azan və iqaməsiz namaz qılan camaatın namazı səhih hesab olunur, lakin vacibi tərk etdiyinə görə tövbə etməsi lazım gəlir. Unutqanlıqdandan və ya bilməyərəkdən bunu edənlər isə müstəsnadır[2]

Tövbənin şərtləri isə bunlardır:

**1)** Tövbəni ixlas ilə Allah üçün etmək;

**2)** Keçmiş günaha görə peşmançılıq hissi keçirtmək;

**3)** Keçmiş günaha bir daha qayıtmamağı niyyət etmək;

---

[1] Fardu-l-kifayə: bir və ya daha çox müsəlmanların yerinə yetirməsi ilə digərləri üçün vacib olmayan əmələ deyilir.

[2] «Məcmu fətava» 22/64-65; «Təmamu-l-Minnə» səh:144; «Namazla əlaqəli mühüm fətvalar», səh: 32-33; «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 2/35-41.

**4)** Keçmiş günahı bir daha təkrar etməmək;

**5)** Tövbəni qəbul olunan vaxtda etmək.

Tövbənin qəbul olunmayan vaxtı ikidir:

**1)** Ölüm anında, can (ruh) boğaza yetişdiyi zaman.

Uca **Allah** buyurur:

وَلَيْسَتِ التَّوْبَةُ لِلَّذِينَ يَعْمَلُونَ السَّيِّئَاتِ حَتَّى إِذَا حَضَرَ
أَحَدَهُمُ الْمَوْتُ قَالَ إِنِّي تُبْتُ الْآنَ وَلَا الَّذِينَ يَمُوتُونَ وَهُمْ كُفَّارٌ
أُولَٰئِكَ أَعْتَدْنَا لَهُمْ عَذَابًا أَلِيمًا ﴿١٨﴾

**«Günah işlər görməkdə davam edərək ölüm yetişən anda" Mən indi tövbə etdim" deyənlərin və kafir olaraq ölənlərin tövbəsi qəbul olunmaz. Biz onlar üçün şiddətli bir əzab hazırlamışıq»[1]**

**2)** Qiyamət günü, günəş məğribdən çıxıb məşriqdə batdığı zaman. Uca **Allah** buyurur:

يَوْمَ يَأْتِي بَعْضُ آيَاتِ رَبِّكَ لَا يَنْفَعُ نَفْسًا إِيمَانُهَا لَمْ تَكُنْ آمَنَتْ مِنْ قَبْلُ
أَوْ كَسَبَتْ فِي إِيمَانِهَا خَيْرًا قُلِ انْتَظِرُوا إِنَّا مُنْتَظِرُونَ ﴿١٥٨﴾

**«Rəbbinin bəzi qiyamət əlamətləri gələcəyi gün əvvəlcə iman gətirməmiş və ya imanında bir xeyir qazanmamış şəxsə** (sonrakı) **imanı heç bir fayda verməz. De ki: "Gözləyin, doğrusu, biz də gözləyirik"»[2]**

Əbu Hüreyrədən (r.a) rəvayət olunan hədisdə deyilir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - demişdir: "Günəş məğribdən çıxmayınca Qiyamət yetişməz. Günəş məğribdən çıxdığı zaman insanların hamısı iman gətirəcək, lakin heç bir şəxsə o gün gətirdiyi

---

[1] ən-Nisa surəsi, 18.

[2] əl-Ənam surəsi, 158.

imanı fayda verməyəcək". Sonra Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - bu ayəni oxudu»[1]

Azan və iqamə yalnız Cümə və fərz namazları üçün verilir.

## ***Azanın şərtləri*** [2]

**1.** Tərtiblə oxunmalı;
**2.** Ardıcıl oxunmalı;
**3.** Vaxtı daxil olduqdan sonra oxunmalı;
**4.** Kəlmələr yanlış oxunmamalı;
**5.** Mötəbər hədislərdə varid olmuş sayda oxunmalı.

## ***Müəzzinin şərtləri*** [3]

**1.** Müsəlman olmalı;
**2.** Ruhi xəstə olmamalı;
**3.** Kişi olmalı;
**4.** Bir nəfər olmalı;
**5.** Adil olmalı;
**6.** Həddi-büluğa çatmış olmalı.

## ***Namaz qılmağın qaydası***

Namaz qılan şəxs heç bir dönmə və fırlanma hərəkətinə yol vermədən bütün bədəni ilə Qibləyə (Məkkə şəhərindəki müqəddəs Kəbəyə tərəf) üz tutmalıdır. Sonra hansı namazı qılmaq niyyətində olduğunu ürəyindən keçirməlidir. Sonra (**Allahu Əkbər**) deyib əllərini çiyinləri və ya qulaqları səviyyəsinə qaldırmalıdır. Buna ihram təkbiri deyilir. Çünki bu ifadəni deyib namaza başlayan adama başqa vaxt halal olan bəzi şeylər də namaz üstündə olduğu müddətdə qadağan olunur (danışmaq, yemək və s.). Sonra sağ əlinin ovcunu sol əlinin

---

[1] Səhihu-l-Buxari, 4636.
[2] «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 2/69.
[3] «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 2/69.

üstünə qoymaq şərtilə əllərini sinəsinə qoymalıdır. Buna qiyam deyilir. Sonra başlanğıc (istiftah) adlanan duanı oxumalıdır: « Subhanəkə Allahummə va bihəmdikə va təbarəkə-s-mukə va təalə cəddukə va lə iləhə ğeürukə».[1]

Duanın tərcüməsi: Ey bütün nöqsanlardan uzaq olan **Allahım**, Sənə həmd osun! Sənin adın mübarəkdir, əzəmətin ucadır! Səndən başqa ilahi yoxdur!

Sonra «Əuzu billəhi minə-ş-şeytani-r-rəcim» deməlidir:

Duanın tərcüməsi: Lənətlənmiş şeytandan **Allaha** sığınıram.

Sonra əl-Fatihə surəsini oxumalıdır: «Bismilləhi-r-rahməni-r-rahim. Əlhəmdu lilləhi rabbi-l-aləmin. Ər-rahməni-r-rahim. Məliki yaumi-d-din. İyyəkə nə'budu və iyyəkə nəstəin. İhdinə-s-sıratal-l-mustəqım. Sırata-l-ləzinə ən'amtə aleyhim, ğeyri-l-məğdubi aleyhim və lə-d-dallin».

Surənin tərcüməsi: Rəhimli, Mərhəmətli Allahın adı ilə! Həmd olsun Allaha - aləmlərin Rəbbinə, Rəhimli, Mərhəmətli olana, din (qiyamət) gününün sahibinə! Biz yalnız Sənə ibadət edirik və yalnız Səndən kömək diləyirik! Bizi doğru yola yönəlt! Nemət verdiyin kəslərin yoluna! Qəzəbə düçar olanların və azanların yoluna yox!

Sonra Amin deməlidir: -tərcüməsi- İlahi qəbul et!

Sonra Qurandan bildiyini (istədiyi qədər) oxumalıdır. Sonra rüku etməli, yəni **Allaha** təzim edərək belini əyməli, belini əyərkən «**Allahu Əkbər**» deməli və əllərini çiyinləri səviyyəsinə qaldırmalıdır. Yaxşı olar ki, belini çanaqdan düz əyib başını qabağa düz tutsun və əllərini dizlərinin üstünə barmaqları bir-birindən aralı olmaq şərtilə qoysun. Rüku vəziyyətində olarkən üç dəfə «Subhanə Rabbiyəl Azım» deməlidir.

Duanın tərcüməsi: Mənim Əzəmətli Rəbbim bütün nöqsanlardan uzaqdır! Bunları da əlavə etmək müstəhəbdir: «Subhanəkə Allahummə Rabbənə və bihamdikə, Allahumə-ğ-firli»

Duanın tərcüməsi: Ey bütün nöqsanlardan uzaq **Allahım**! Rəbbim Sənə həmdlər olsun! **Allahım** məni bağışla!

---

[1] Sünnədə başqa istiftah duaları da varid olub.

Sonra «Səmiəllahu limən hamidəh» deyə-deyə rüku vəziyyətindən qalxmalı və əllərini çiyinləri səviyyəsinə qaldırmalıdır.

Duanın tərcüməsi: **Allah** Ona həmd edənləri eşidər!

Rükudan qalxıb dikəldikdən sonra «Rabbənə və ləkəl həmd» və ya «Rabbənə və ləkəl həmd! Həmdən kəsiran tayyibən mubarakən fihi mil'ə-s-səməvati və mil'ə-l-ərd və mil'ə mə şi'tə min şeyin bə'd» deməlidir.

Birinci duanın tərcüməsi: Ey Rəbbimiz! Sənə həmdlər olsun!

İkinci duanın tərcüməsi: Ey Rəbbimiz! Sənə göylər və yer dolusu, onlardan başqa da istədiyin qədər çoxlu, gözəl və uğur dolu həmdlər olsun!

Sonra **Allaha** mütiliklə və ehtiramla birinci səcdəyə gedə-gedə **«Allahu Əkbər»** deməli, hər iki əlinin pəncəsi, iki dizi və hər iki ayağının barmaqları üzərində yerə çökməli, qollarının dirsəkdən yuxarı hissəsini böyürlərindən aralamalı, dirsəkləri yerə qoymamalı, barmaqlarının uclarını qibləyə yönəltməlidir. Bu zaman dizlərini bir-birindən aralı tutmalı, dabanlarını isə birləşdirməlidir. Səcdə vəziyyətində olarkən üç dəfə «Subhanə Rabbiyəl Ə'lə» deməlidir.

Duanın tərcüməsi: Mənim Uca Rəbbim bütün nöqsanlardan uzaqdır! Bunları da əlavə etmək müstəhəbdir: «Subhanəkə Allahummə Rabbənə və bihamdikə, Allahumə-ğ-firli»

Sonra səcdədən başını qaldıra-qaldıra «**Allahu Əkbər**» deməlidir.

Sağ əlini barmaqları açıq şəkildə sağ budunun dizə yaxın yerinə, sol əlini də barmaqları açıq şəkildə sol budunun dizə yaxın yerinə qoymalıdır. İki səcdə arasındakı oturuşu zamanı «Rabbi-ğ-firli vərhamni vəhdini vərzuqni vəcburni və'fini» və ya «Rabbi-ğ-firli, Rabbi-ğ-firli» deməlidir.

Duanın tərcüməsi: «Ey Rəbbim, məni bağışla! Mənə rəhm et! Məni doğru yola yönəlt, mənə ruzi ver, əyər-əskiyimi düzəlt, özümü sağlam et!», «Ey Rəbbim, məni bağışla! Ey Rəbbim, məni bağışla!»

Sonra **Allaha** mütilik və ehtiramla birinci səcdədə dediklərini, etdiklərini, səcdəyə gedərkən təkbiri təkrar etməklə ikinci səcdəni yerinə yetirməlidir.

Sonra ikinci səcdədən qalxa-qalxa «**Allahu əkbər**» deməlidir. Bunun ardınca başlanğıc duasını oxumadan birinci rək'ətdə dediklərini

və etdiklərini təkrarlamaqla ikinci rək'əti qılmalıdır. İkinci rək'əti qılıb qurtarandan sonra «**Allahu əkbər**» deyib sonra sol ayağının üstündə pəncəsinin üzünü yerə qoymaqla yanakı oturub sağ ayağını barmaqları üstdə şaquli vəziyyətdə saxlamalı və sağ əlini sağ budunun dizə yaxın hissəsinə qoyaraq adsız və çeçələ barmaqlarını qatlamalı, dua edərkən şəhadət barmağı qaldırıb yuxarı-aşağı hərəkət etdirməli və ya düz saxlamalı, baş barmağın və orta barmağın uclarını qoşalaşdırıb halqa şəklində saxlamalıdır. Sol əlini isə barmaqları açıq şəkildə sol budunun dizə yaxın yerinə qoymalıdır. Bu oturuş zamanı təşəhhüd, salavat və istiazə **Allaha** pənahaparma dualarını oxumalıdır: «Əttəhiyyatu lilləhi və-s-saləvatu və-t-tayibət, əs-sələmu aleykə eyyuhə-n-nəbiyu və rahmətullahi və bərakətuh, əs-səlamu aleynə və alə ibadilləhi-s-salihin, əşhədü ən lə iləhə illəllahu və əşhədu ənnə Muhəmmədən abduhu və rasuluh, Allahummə salli alə Muhəmmədin və alə ə'li Muhamməd, kəmə salleytə alə İbrahimə və alə ə'li İbrahimə innəkə həmidun məcid, və barik alə Muhəmmədin və alə ə'li Muhamməd, kəmə bəraktə alə İbrahimə və alə ə'li İbrahimə innəkə həmidun məcid, Allahummə inni əuzu bikə min azəbi-l-qabr, və min azəbi cəhənnəm, və min fitnəti-l-məhyə və-l-məmət, və min şərri fitnəti-l-məsihi-d-dəccəl»

Duanın tərcüməsi: Bütün alqışlar, dualar **Allaha**, bütün yaxşı işlər **Allah** üçün edilir. Ey Peyğəmbər, sənə salam olsun, **Allahın** mərhəməti bərəkətləri yetişsin! Bizə və **Allahın** əməlisaleh bəndələrinə salam olsun! Mən şahidlik edirəm ki, **Allahdan** başqa ilahi yoxdur və şahidlik edirəm ki, Məhəmməd Onun qulu və elçisidir. **Allahım**! Məhəmmədə və onun ailəsinə də İbrahimə və onun ailəsinə xeyir-dua verdiyin kimi xeyir-dua ver! Sən həqiqətən alqışlara layiq və şan-şövkətlisən! Məhəmmədə və onun ailəsinə də İbrahimə və onun ailəsinə bərəkər verdiyin kimi bərəkət ver! Sən həqiqətən alqışlara layiq və şan-şövkətlisən! **Allahım**! Həqiqətən, mən qəbir əzabından, cəhənnəm əzabından, həyatın və ölümün fitnəsindən və yalançı məsihin (Allahlıq və yə reyğəmbərlik iddiası edən) fitnəsinin şərindən Sənə sığınıram!

Sonra dua edib Rəbbindən dünya və axirət nemətlərindən istədiyini diləyə bilər.

Sonra sağ tərəfə salam verir: «əs-sələmu aleykum və rahmətullah» - Sizə salam olsun və **Allahın** mərhəməti yetişsin!» - Sol tərəfə də eləcə salam verə bilər.

Namaz üç, yaxud dörd rək'ətdən ibarət olsa, təşəhhüd duasını bu cümləyəcən oxumalıdır: «əşhədu ən lə iləhə iləllah və əşhədu ənnə MuhamməDən abduhu va rasuluh). Sonra «**Allahu əkbər**» deyərək ayağa qalxmalı və bu zaman əllərini çiyinləri səviyyəsinə qaldırmalıdır.

Sonra namazının qalan hissəsini də ikinci rək'əti qıldığı kimi qılmalıdır. Fərq yalnız bundan ibarətdir ki, sonrakı rək'ətlərdə başqa surə oxumayıb əl-Fatihə ilə kifayətlənir. Sonra yanakı (təvərrük qaydasında) oturmalı, bu zaman sağ ayağını (əvvəl göstərildiyi kimi) şaquli vəziyyətdə saxlamalı və sol ayağını onun altından sağ tərəfə çıxarmalı, əllərini birinci təşəhhüdü oxuyarkən olduğu kimi, budlarının üstünə qoymalıdır. Bu oturuş zamanı təşəhhüd, salavat və istiazə dularını bütünlüklə oxumalıdır. Sonra sağ tərəfə salam verib deməlidir: «əs-sələmu aleykum və rahmətullah» - Sol tərəfə də eləcə salam verə bilər.[1]

## Bəzi namazlar barəsində müxtəsər məlumatlar

### *Fəcr namazı* [2]

«Fəcr»- dan yerinin ağarmasına deyilir.[3] Buna həmçinin «Sübh» namazı da deyilir.

Fəcr namazı iki rək'ətli səslə qılınan namazdır. Bu namazdan yalnız əvvəl iki rək'ət (daima) sünnə namazı qılmaq olar.

Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - Fəcr namazını qılarkən, hicablarına bürünmüş mömin qadınlar da ona qoşulardı. (Namazlarını qıldıqdan) sonra isə evlərinə qayıdar və qaranlıq olduğundan heç kəs onları tanımazdı»[4]

---

[1] Namazdan sonrakı zikrlər üçün bax: «Müsəlmanın qalası».
[2] Bax: əl-İsra surəsi. 78; ən-Nur surəsi. 58.
[3] «əl-Mu'cəmu-l-Vasit» səh: 675.
[4] Səhihu-l-Buxari, 578; Səhih Müslim, 1456.

Cabir ibn Abdullah (r.a) rəvayət edir ki, «……Sübh namazını Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - hava işıqlaşmamış (qaranlıqda) qılardı»[1]

Əbu-l-Minfəl[2] rəvayət edir ki, «Mən və atam, Əbu Bərzətə əl-Əsləminin yanına getdik. Atam ona: "Danış, görək Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - namazları necə qılardı?» – deyə müraciət etdikdə, o dedi: "Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - Sübh namazını hər bir kəsin yanındakını seçdiyi vaxtda (hava bir az işıqlandıqda) bitirərdi. Bu namazda o, altmış ayədən yüz ayəyə qədər oxuyardı»[3]

Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - başqa nafilə namazlarına nisbətən Fəcr namazının sünnəsinə daha çox davamlı və daha çox bağlı idi»[4]

Başqa rəvayətdə: «Fəcr namazının iki rək'əti dünya və içindəkilərdən xeyirlidir»[5]

**Fəcr namazının vaxtı:** dan yerinin ağarmasından günəş çıxanadək.

## ***Zöhr namazı*** [6]

«Zöhr» – günorta vaxtına deyilir.[7] Buna həmçinin «əl-Hacira» də deyilir.

Zöhr namazı dörd rək'ətli səssiz qılınan namazdır. (Bax: Namazda bəyənilən əməllər 7-ci bənd). Bu namazdan əvvəl (daima) iki və ya dörd (iki-iki) rək'ət, sonra da iki rək'ət sünnə namazı qılmaq olar.

Əbu-l-Minfəl rəvayət edir ki, «Mən və atam, Əbu Bərzətə əl-Əsləminin yanına getdik. Atam ona: "Danış, görək Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - namazları necə qılardı?» – deyə müraciət

---

[1] Səhihu-l-Buxari, 560; Səhih Müslim, 1458.
[2] Adı: Səyyar ibn Sələmə.
[3] Səhihu-l-Buxari, 547; Səhih Müslim, 1403.
[4] Səhihu-l -Buxari, 1163.
[5] Səhih Müslim, 1685.
[6] Bax: əl-İsra surəsi. 78.
[7] «əl-Mu'cəmu-l-Vasit» səh: 578.

etdikdə, o dedi: "Peyğəmbər **- səllallahu aleyhi və səlləm -** əl-Hacira – sizin saydığınız ilk namazı – günəş zeniti keçdikdə qılardı…»[1]

Abdullah ibn Ömər (r.a) rəvayət edir ki, «Mən Peyğəmbər **- səllallahu aleyhi və səlləm -** ilə bir yerdə Zöhrdən əvvəl və sonra, həmçinin Cümə, Məğrib və İşa namazlarından sonra da iki rək'ət namaz qıldım»[2]

Ummu Həbibə (r.a) rəvayət edir ki, Peyğəmbər **- səllallahu aleyhi və səlləm -** dedi: «Gün ərzində on iki rək'ət sünnə namazı qılan şəxs üçün Cənnətdə bir ev bina olunar!»[3]

Aişə (r.a) rəvayət edir ki, Peyğəmbər **- səllallahu aleyhi və səlləm -** dörd rək'ət Zöhrdən əvvəl və iki rək'ət sonra, iki rək'ət Məğribdən sonra, iki rək'ət İşadan sonra və iki rək'ət də Fəcrdən əvvəl namaz qılardı![4]

**Zöşr namazının vaxtı:** günəş zeniti keçdikdən sonra əşyaların hündürlüyü ilə kölgələrinin uzunluğunun bərabərləşdiyi anadək (Əsr namazınadək).

## ***Əsr namazı*** [5]

«Əsr»- axşam çağına deyilir.[6] Buna həmçinin «orta namaz» da deyilir.

Uca **Allah** buyurur:

حَافِظُوا عَلَى الصَّلَوَاتِ وَالصَّلَوٰةِ الْوُسْطَى

**«**[Fərz, vacib] **namazlara, xüsusilə orta namaza** (günortadan sonrakı Əsr namazına) **riayət edin….»[7]**

Əsr namazı dörd rək'ətli səssiz qılınan namazdır. Bax: Namazda bəyənilən əməllər 7-ci bənd. Bu namazdan əvvəl iki və ya dörd rək'ət

---

[1] Səhihu-l-Buxari, 547; Səhih Müslim, 1403.
[2] Səhihu-l-Buxari, 937.
[3] Səhih Müslim, 1691.
[4] Səhih Müslimin şərhi, 6/251.
[5] Bax: əl-İsra surəsi, 78.
[6] «əl-Mu'cəmu-l-Vasit» səh: 604.
[7] əl-Bəqərə surəsi, 238.

sünnə namazının qılınması sünnədə sabit olmamışdır. Yalnız azan və iqamə arsındakı iki rək'ətdən müstəsnadır.[1]

Cabir ibn Abdullah (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - günəş parlaq olduqda (hələ batmasına çox olan halda) əsri qılardı»[2]

Əbu-l-Minfəl rəvayət edir ki, «Mən və atam, Əbu Bərzətə əl-Əsləminin yanına getdik. Atam ona: "Danış, görək Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - namazları necə qılardı?» – deyə müraciət etdikdə, o dedi: "Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - Əsri qıldıqdan sonra bizlərdən biri şəhərin kənarında yerləşən evinə qayıdar, günəş isə hələ də parlaq idi...»[3]

Əli (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - Xəndək günü[4] dedi: "Onlar (müşriklər) bizi orta namazdan (Əsr namazından) gün batana qədər yayındırdılar. Allah onların evlərini və qəbirlərini odla doldursun!…"»[5]

**Əsr namazının vaxtı:** əşyaların hündürlüyü ilə kölgələrinin uzunluğunun bərabərləşdiyi andan əşyaların kölgələrinin uzunluğunun onların hündürlüyündən iki dəfə artıq olan anadək (caiz vaxtı) və ya gün batanadək (zəruri halda).

## ***Məğrib namazı*** [6]

«Məğrib»- günəşin batdığı vaxta və yerə deyilir.[7]

Məğrib namazı üç rək'ətli, iki rək'ət səslə və bir rək'ət səssiz qılınan namazdır. Bu namazdan yalnız sonra iki rək'ət (daima) sünnə namazı qılmaq olar.

Cabir ibn Abdullah (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - günəş batdıqda Məğrib namazını qılardı…»[1]

---

[1] «Məcmu fətava» 23/124-126; «Təmamu-l-Minnə» səh:241-242.
[2] Səhihu-l-Buxari, 560; Səhih Müslim, 1458.
[3] Səhihu-l-Buxari, 547; Səhih Müslim, 1403.
[4] Xəndək döyüşündə.
[5] Səhihu-l-Buxari, 2931; Səhih Müslim, 1424.
[6] Bax: əl-İsra surəsi, 78-ci ayə.
[7] «əl-Mu'cəmu-l-Vasit» səh: 647.

Abdullah ibn Ömər (r.a) rəvayət edir ki, «Mən Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - ilə bir yerdə Zöhrdən əvvəl və sonra, həmçinin Cümə, Məğrib və İşa namazlarından sonra da iki rək'ət namaz qıldım»[2]

Cübeyr ibn Mutim (r.a) rəvayət edir ki, «Mən Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - Məğrib namazında "Tur" surəsini oxuduğunu eşitdim»[3]

**Məğrib namazının vaxtı:** qünəş batan andan qaranlıq çökənədək. (Üfüqdə olan qızartı itənə qədər)

## ***İşa namazı*** [4]

«İşa»- axşamüstü mənasını daşıyır.[5] Buna həmçinin «əl-Atəmətu» da deyilir.

İşa namazı dörd rək'ətli, iki rək'ət səslə və iki rək'ət səssiz qılınan namazdır. Bu namazdan yalnız sonra iki rək'ət (daima) sünnə namazı qılmaq olar.

Cabir ibn Abdullah (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - İşa namazını səhabələrin toplandığını gördükdə tez (vaxtı girəndə), yubandıqlarını gördükdə isə gec qılardı…»[6]

Əbu-l-Minfəl rəvayət edir ki, «Mən və atam, Əbu Bərzətə əl-Əsləminin yanına getdik. Atam ona: "Danış, görək Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - namazları necə qılardı?» – deyə müraciət etdikdə, o dedi: "Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - "əl-Atəmətu" adlandırdığınız İşa namazını gecikdirməyi xoşlayar, ondan qabaq yatmağı və ondan sonra danışmağı isə bəyənməzdi….»[7]

əl-Bəra ibn Azib (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - səfərdə ikən İşa namazını qıldı və iki rək'ətdən birində "Tin"

---

[1] Səhihu-l-Buxari, 560; Səhih Müslim, 1458.
[2] Səhihu-l-Buxari, 937.
[3] Səhihu-l-Buxari, 765; Səhih Müslim, 1035.
[4] Bax: əl-İsra surəsi. 78.
[5] Bax: Yusif surəsi, 16-cı ayə; «əl-Mu'cəmu-l-Vasit» səh: 603.
[6] Səhihu-l-Buxari, 560; Səhih Müslim, 1458.
[7] Səhihu-l-Buxari, 547; Səhih Müslim, 1403.

surəsini oxudu. Mən onun kimi gözəl səslə – və ya qiraətlə – oxuyan dinləməmişdim»[1]

Abdullah ibn Ömər (r.a) rəvayət edir ki, «Mən Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - ilə bir yerdə Zöhrdən əvvəl və sonra, həmçinin Cümə, Məğrib və İşa namazlarından sonra da iki rək'ət namaz qıldım»[2]

**İşa namazının vaxtı:** qaranlıq çökəndən gecəyarısınadək (gün batan andan dan yeri sökülənədək olan vaxtın yarısı).[3]

**Qeyd: *** Yalnız Fəcr, Zöhr, Əsr, Məğrib və İşa namazlarını gündəlik qılmaq hər bir həddi-büluğa çatmış, ruhi xəstə olmayan müsəlmana fərzdir.

***** Fərz namazlarını, həmçinin Vitr, Kusuf (Xusuf), İstisqa, Səfər, Qorxu, Cənazə, Təravih namazlarını tək və ya camaat şəklində qılmaq caizdir. Cümə namazı isə yalnız camaat şəklində qılınmalıdır. Qalan nafilə namazları isə müstəqil qılınır.

***** Bu namazlar üçün verilən hər bir azan və iqamə arasında iki rək'ət nafilə namazı qılmaq olar.

Abdullah ibnu-l-Muğaffəl (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «Kim istəyirsə azan və iqamə arasında namaz qılsın.»[4]

## ***Cümə namazı***

«Cümə»- Hicri tarixində həftənin 7-ci (istirahət) gününə, miladi tarixində isə həftənin 5-ci gününə deyilir. Bu gün həmçinin «Cumu'ə» və «Cumə'ə» də adlanır.[5] Bu gün camaatın məsciddə toplanıb birgə qıldıqları namaz da belə adlanır.[6]

---

[1] Səhihu-l-Buxari, 769; Səhih Müslim, 1039.
[2] Səhihu-l-Buxari, 937.
[3] «Təmamu-l-Minnə» səh:142.
[4] Səhihu-l-Buxari, 625.
[5] «əl-Mu'cəmu-l-Vasit» səh: 135.
[6] Bax: «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 5/5.

Cümə namazı iki xütbə və iki rək'ət səslə qılınan namazdan ibarətdir. Bu namazdan yalnız sonra (daima) iki və ya dörd (iki-iki) rək'ət sünnə namazı qılmaq olar.

Abdullah ibn Ömər (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - (cüm'ə günü) iki xütbə verər və onların arasında oturardı»[1]

Abdullah ibn Abbas (r.a.) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - Cümə günü Fəcr namazının birinci rək'ətində «əs-Səcdə», ikinci rək'ətində isə «əl-İnsan»- surələrini, Cümə namazının birinci rək'ətində «əl-Cumu'ə»-ikinci rək'ətində isə «əl-Munafiqun»-surələrini oxuyardı.[2]

Abdullah ibn Ömər (r.a) rəvayət edir ki, «Mən Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - ilə bir yerdə Zöhrdən əvvəl və sonra, həmçinin Cümə, Məğrib və İşa namazlarından sonra da iki rək'ət namaz qıldım»[3]

Əbu Hureyrə (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «Sizdən biriniz Cümə namazını qıldıqdan sonra dörd rək'ət namaz qılsın!»[4]

Burada dörd rək'ət namaz deyildikdə Cümədən sonra Zöhr namazını qılmaq qəsd olunmur. Bu dörd rək'ətin sünnə namazı olduğuna Muslimin başqa rəvayəti dəlalət edir:

Əbu Hureyrə (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «Sizdən biriniz Cümə namazından sonra namaz qılmaq istəsə, dörd rək'ət namaz qılsın!»[5]

Cümə namazının fəziləti: Uca **Allah** buyurur:

يَا أَيُّهَا الَّذِينَ آمَنُوا إِذَا نُودِيَ لِلصَّلَاةِ مِن يَوْمِ الْجُمُعَةِ فَاسْعَوْا إِلَىٰ ذِكْرِ
اللَّهِ وَذَرُوا الْبَيْعَ ۚ ذَٰلِكُمْ خَيْرٌ لَّكُمْ إِن كُنتُمْ تَعْلَمُونَ ﴿٩﴾

---

1 Səhihu-l-Buxari, 920; Səhih Müslim, 1992.
2 Səhih Müslim, 2028.
3 Səhihu-l-Buxari, 937.
4 Səhih Müslim, 2033.
5 Səhih Müslim, 2035.

**«Ey iman gətirənlər! Cümə günü namaza çağrıldığınız zaman Allahı zikr etməyə tələsin və alış-verişi buraxın. Bilsəniz, bu sizin üçün nə qədər xeyirlidir!»[1]**

Əbu Hüreyrə (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: "Cənabət qüslü (kimi qüsl) edib, cümə gününün *ilk saatında*[2] məscidə gedən şəxs bir dəvə, ikinci saatında gedən bir öküz, üçüncü saatında gedən bir qoç, dördüncü saatında gedən bir xoruz, beşinci saatında gedən isə bir yumurta qurban etmiş[3] kimidir. İmam minbərə çıxdıqda isə artıq mələklər onun xütbəsini dinləyər"»[4]

"Cümə namazını qılmaq yalnız aşağıdakı sifətlərə malik olan şəxsə vacibdir:[5]

* Kişi olmalı (qadın müstəsnadır);

* Azad insan olmalı (qul, dustaq və s. azad olmayan müstəsna- dır və yalnız icazə verildiyi zaman onlara Cümə namazına getmək vacibdir);

* Mükəlləf - həddi-büluğa çatmış, ağıllı-olmalı (Uşaq və ruhi xəstə müstəsnadır);

* Müsəlman olmalı (kafir müstəsnadır);

* Yaşadığı yerin vətəndaşı olmalı (müsafir və müvəqqəti qeydiyyatda olan sakin müstəsnadır);

Müstəsna olan şəxslərin (kafir və ruhi xəstədən başqa) Cümə namazına getməsi müstəhəbdir."

Xütbəni qısa etmək, uca səslə vermək Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - sünnəsindəndir.

Ammar (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «Namazı uzatmaq, xütbəni qısa etmək xətibin (xütbə verənin) fəqih olmasının (şəriət elmlərini başa düşməsinin) əlamətlərindəndir!»[6]

---

[1] əl-Cumuə surəsi, 9-cu ayə.
[2] Bu əlavəni müəllif imam Malikin «Muvatta» əsərindən götürüb.
[3] Sədəqə vermiş.
[4] Səhihu-l-Buxari, 881; Səhih Müslim, 1961.
[5] Bax: «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 5/7-16.
[6] Səhih Müslim, 2006.

Cabir ibn Abdulluh(r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - xütbə verdiyi zaman qoşuna öyüd-nəsihət verən sərkərdə kimi gözləri qızarar, səsini qaldırar və qəzəblənərdi…»[1]

**Cümə namazının vaxtı:** "İslam alimləri Cümə namazının əvvəl vaxtı barəsində ixtilaf etmişlər. Lakin qeyd etmək lazımdır ki, bu namazı Zöhr namazının başlandığı vaxt qılmaq əfzəl[2], günəş səmanın ortasına (zenitə) yüksəlməmişdən bir saat əvvəldən Zöhr namazının axır vaxtına qədər qılmaq caizdir[3]."[4]

Sələmətu ibn əl-Əkva (r.a) – ağacın altında beyət[5] etmiş səhabələrdəndir – rəvayət edir ki, «Biz Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - ilə bərabər Cümə namazını, divarların kölgələnə biləcəyimiz kölgəsi olmadığı bir zamanda qılıb qurtarardıq»[6]

Başqa rəvayətdə: «Biz Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - ilə bərabər, günəş zeniti keçdikdən sonra Cümə namazını qılar, sonra da kölgələnmək üçün yer axtarardıq»[7]

Cümə namazında olanların sayı üç və daha çox olmalıdır. Üç nəfərdən az Cümə namazı qılmaq olmaz.[8]

Cümə namazının ikinci rək'ətinin rükusuna və ondan əvvəl namaza yetişən şəxs Cümə namazını qılmış sayılır, ikinci rək'ətin rükusundan sonra namaza yetişən şəxs isə Cümə namazına gecikmiş hesab olunur və o Zöhr namazını qılmalıdır.[9]

## ***Bayram namazı***

---

[1] Səhih Müslim, 2002.

[2] Çünki Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - daima belə edərdi.

[3] Çünki Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - hərdən belə edərdi.

[4] Bax: «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 5/41-42.

[5] Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - yanında sədaqət andı içmək. Bu beyət Hudeybiyyə sülhü ərəfəsində olub və orada 1400 və ya bir az çox səhabə iştirak edib.

[6] Səhihu-l-Buxari, 4168; Səhih Müslim, 1990.

[7] Səhih Müslim, 1989.

[8] Bax: «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 5/51-53.

[9] Bax: «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 5/43-44.

İslam dinində yalnız iki bayram mövcuddur ki, bunlar da «Fitr (Oruc)» və «Ədha (Qurban)» bayramlarıdır. Digər bayramlar isə dində olmayan adət-ənənədən hesab olunur. Bu bayramları Uca **Allah** Quranda xüsusən qeyd etmişdir.

Uca **Allah** buyurur:

وَاذْكُرُوا اللَّهَ فِي أَيَّامٍ مَعْدُودَاتٍ

**«Sayı bəlli olan günlərdə Allahı yada salın!»[1]**

Bu ayədə təşriq günləri qəsd olunur. Yəni, zil-Hiccə ayının 10-13-cü günləri.[2]

Uca **Allah** buyurur:

يُرِيدُ اللَّهُ بِكُمُ الْيُسْرَ وَلَا يُرِيدُ بِكُمُ الْعُسْرَ وَلِتُكْمِلُوا الْعِدَّةَ
وَلِتُكَبِّرُوا اللَّهَ عَلَىٰ مَا هَدَاكُمْ وَلَعَلَّكُمْ تَشْكُرُونَ ﴿١٨٥﴾

**«Allah sizin üçün ağırlıq deyil, yüngüllük istər ki, fövtə gedən günlərin sayını tamamlayasınız və sizi düz yola yönəltməsinə görə Ona** [«**Allahu Əkbər**» deməklə] **təzim və bəlkə də şükr edəsiniz»[3]**

Bu ayədə «Fitr» bayramı da qəsd olunur.[4]

«Fitr»- Orucu dayandırma, nəhayət vermə deməkdir.[5]

«Ədha»- Qurban vermək deməkdir.[6]

Bayram namazı, iki rək'ət səslə qılınan namaz və iki xütbədən ibarətdir. Bu namazdan nə əvvəl nə də sonra sünnə namazı qılınmır.

Abdullah ibn Abbas (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - Fitr bayramının namazını qıldı, ondan nə əvvəl nə də sonra namaz qılmadı.»[7]

---

[1] əl-Bəqərə, 203.
[2] İbn Kəsirin təfsiri, 1/331.
[3] əl-Bəqərə, 185.
[4] «Məcmu fətava» 24/240.
[5] «əl-Mu'cəmu-l-Vasit» səh: 694.
[6] «əl-Mu'cəmu-l-Vasit» səh: 535.
[7] Səhihu-l-Buxari, 964; Səhih Muslim, 2054.

"Bayram namazlarını qılmaq hər bir həddi-büluğa çatmış, ağıllı olan müsəlmana fərzdir. Buna dəlil olaraq aşağıdakı hədisi göstərmək olar:

Ummu Atiyyə[1] (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - bakirə qızların, heyzli qadınların bayram namazlarına gəlməsini bizə əmr edər və heyzli qadınları namaz qılınan yerdən uzaqlaşdırardı»[2]

Başqa rəvayətdə: «Bakirə qızları və heyzli qadınları bayram namazına çıxartmaq bizə əmr olunardı. Heyzli qadınlar o günün xeyir-bərəkətinə nail olmaq üçün camaatın arxasında (namaz qılınan yerdən aralı) oturar, təkbir və dua edərdilər»[3]"[4]

"Bayram namazını qılmaq müsafir və müvəqqəti qeydiyyatda olan sakinə fərz deyildir. Çünki Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - bayram namazlarının hamısını Mədinə şəhərində qılmışdır. O, Məkkənin fəth olduğu ildə (hicrətin 8-ci ilində) Şəvval ayının əvvəlinə qədər orada qalmış və bayram namazını qılmamışdır. Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - vida həccində bayram günü Minada[5] qalmış və müsafir olduğu üçün bayram namazını qılmamışdır. Həmçinin Ərafa günü (zil-Hiccə ayının 9-u) müsafir olduğu üçün Cümə namazını qılmamışdır."[6]

Bayram namazından əvvəl azan və iqamə vermək sünnəyə müxalifdir.

Cabir (r.a) rəvayət edir ki, «Mən, Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - qıldığı bayram namazının şahidi oldum. O, xütbədən əvvəl azan və iqamə vermədən bayram namazını qıldı və (xütbə zamanı) səhabələrə Allahdan qorxmağı, Ona itaət etməyi əmr etdi. Sonra onlara öyüd-nəsihət etdi və (Allahın axirət gününə hazırladığı nemət və əzabını) xatırlatdı. Daha sonra Bilalın (r.a) əlindən tutub qadınların yanına getdi. Onlara da öyüd-nəsihət edib xatırlatdıqdan sonra dedi: "Həqiqətən,

---

[1] Adı: Nuseybətu bint Kəb əl-Ənsariyyə.

[2] Səhihu-l-Buxari, 351; Səhih Müslim, 2051.

[3] Səhihu-l-Buxari, 971.

[4] «əl-İxtiyarat» səh: 82; «Kitabu-s-salah» səh: 11; «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 5/151.

[5] Məkkənin yaxınlığında yerləşən yer adıdır - «əl-Mu'cəmu-l-Vasit» səh: 889.

[6] «əl-Muğni» 3/287; «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 5/169.

Cəhənnəm əhlinin (sakinlərinin) əksəriyyəti siz[1] olacaqsınız". Onların arasından bir qarayanız qadın ayağa qalxıb: "Nə üçün, ey Allahın elçisi?" – deyə soruşduqda, o dedi: "Çünki, siz (qadınlar) çox gileylənir və ərlərinizin sizə etdiyi yaxşılıqlara qarşı nankorluq edirsiniz". Qadınlar da bər-bəzəklərini, sırğa və üzüklərini Bilalın (r.a) ətəyinə atıb Allah yolunda sədəqə verdilər»[2]

Bayram namazının xütbəsi Cümə namazının xütbəsindən fərqli olaraq namazdan sonra olur.

Abdullah ibn Ömər (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** -, Əbu Bəkr (r.a) və Ömər (r.a) bayram namazlarını xütbədən əvvəl qılardılar»[3]

əl-Bəra ibn Azib (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - Qurban bayramında namazdan sonra verdiyi xütbədə dedi: "Bizim kimi namaz qılıb qurban kəsənin qurbanı qəbul olunur. Namazdan əvvəl bunu edənin kəsdiyi (heyvan) qurban kimi qəbul olunmur"». Əl-Bəra ibn Azibin (r.a) dayısı Əbu Burdətə ibn Niyar (r.a) deyir ki, «Mən Peyğəmbərə - **səllallahu aleyhi və səlləm** -: "Ey Allahın elçisi! Mən bu günün yemək-içmək (bayram) günü olduğunu bilib bir qoyun kəsdim. Bu qoyun evimdə kəsilən ilk heyvan olsun deyə onu namazdan əvvəl kəsdim və nahar etdim" – dedikdə, o dedi: "Kəsdiyin qoyun yalnız yemək üçündür (qurban kimi qəbul olunmur)". Mən Peyğəmbərdən - **səllallahu aleyhi və səlləm** - "Ey Allahın elçisi! Mənim evimdə iki qoyundan da sevimli olan bir çəpişim var. Onu kəssəm qurbanı əvəz edərmi?" – deyə soruşduqda, o dedi: "Bəli, lakin səndən sonra belə edənin (bayramdan əvvəl kəsdiyi heyvanının) əvəzini verməz"»[4]

Cundub ibn Abdullah əl-Bəcəli (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - Qurban günü (bayram) namazı qıldı, sonra xütbə verdi, daha sonra qurbanlıq heyvanı kəsdi və dedi: «Namazdan əvvəl qurban kəsən, (bayram namazından sonra) onun əvəzinə başqa

---

[1] Yəni, qadınlar.
[2] Səhihu-l-Buxari, 978; Səhih Müslim, 2041.
[3] Səhihu-l-Buxari, 963; Səhih Müslim, 2041.
[4] Səhihu-l-Buxari, 955; Səhih Müslim, 5042, 5043.

bir heyvan kəssin! Qurban verməyən isə, Allahın adını çəkib ("bismilləh" deyib) heyvanı kəssin!"»[1]

«Allahu əkbər, Allahu əkbər, lə iləhə illəllah, Allahu əkbər, Allahu əkbər və ilıəhi-l-həmd». Bu duanı hər kəs bayram günü camaatla (xorla) deməmək şərtilə təkrarlamalıdır.[2]

**Bayram namazının vaxtı:** Günəş üfüqdən bir nizə hündürlüyündə təxminən bir metrə qalxdıqdan sonra (yəni, təqribən günəş çıxdıqdan on beş dəqiqə sonra) günəş səmanın ortasına (zenitə) yüksəlməsindən bir az əvvələdək (təqribən on dəqiqə qabaq).[3]

Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - və raşidi xəlifələr bayram namazlarını bu vaxt qılmışlar.[4]

## ***Bayram namazının qılınması*** [5]

Birinci rək'ətdə ehram təkbirini edib, «istiftah» duasını oxuduqdan sonra altı dəfə əlləri çiyinlər səviyyəsinə qaldıraraq təkbir etmək, sonra isə digər fərz namazlarında olduğu kimi həmən rək'əti tamamlamaq. İkinci rək'ətə qalxdıqdan sonra isə beş dəfə əlləri çiyinlər səviyyəsinə qaldıraraq təkbir etmək və həmin qaydada o rək'əti təşəhhüd və salamlarla tamamlamaq lazımdır.

Bayram namazını camaatla qılmayan şəxsin bu namazın qəzasını qılması sünnəyə ziddir. Çünki, Peyğəmbərimizdən - **səllallahu aleyhi və səlləm** - bayram namazının qəzasını qılmaq varid olmayıb.[6]

## ***Vitr namazı***

«Vitr» - tək deməkdir.[1]

---

[1] Səhihu-l-Buxari, 985; Səhih Müslim, 5037.

[2] «Məcmu fətava» 24/240-245.

[3] «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 5/154-156.

[4] «Sünənu Əbi Davud» 1135; ibn Macənın «Sünən ibn Macə» 1317; «Sünənu-l-Beyhəqi» 3/282; «Nasbu-r-rayə» 2/211.

[5] «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 5/176.

[6] «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 5/208.

Bu, gecə qılınan tək saylı namazdır. Gecə namazlarından (təhəccütdən) sonra və onlarsız da qılınır.

Uca **Allah** buyurur:

إِنَّ رَبَّكَ يَعْلَمُ أَنَّكَ تَقُومُ أَدْنَى مِن ثُلُثَيِ اللَّيْلِ
وَنِصْفَهُ وَثُلُثَهُ وَطَائِفَةٌ مِّنَ الَّذِينَ مَعَكَ

**«Həqiqətən, Rəbbin bilir ki, sən** (yatağından) **qalxıb bəzən gecənin təqribən üçdən ikisini, bəzən yarısını, bəzən də üçdən birini namaz qılırsan. Səninlə birlikdə olan bir zümrə** (səhabələrin) **də belədir.»**[2]

Abdullah ibn Ömər (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - minbərdə ikən bir kişi ondan gecə namazı haqqında soruşduqda o, dedi: "İki rək'ət, iki rək'ət qılın. Sübh namazının vaxtının daxil olmasından qorxduğunuz zaman bir rək'ət (vitr) namaz qılıb cüt-cüt qıldığınız namazların (cəmi) sayını təkləşdirin"; Beləliklə də "Vitri gecə qıldığınız namazların sonuncusu edin!"»[3]

Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - gecənin hər vaxtında – əvvəlində, ortasında və axırında Vitr namazını qılardı. (Əfzəl olduğu üçün) Vitri sübh namazına yaxın (gecənin sonunda) qılardı»[4]

Abdullah ibn Ömər (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi «Vitr gecənin axırında qılınan bir rək'ətdir!»[5]

– Əl-Mühamili Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - Vitr namazının növlərini aşağıdakı kimi qeyd etmişdir:

a) bir rək'ət;

b) üç rək'ət (iki, sonra da bir ayrı, və ya üç rək'ət ardıcıl);

v) beş rək'ət (ardıcıl);

---

[1] «əl-Mu'cəmu-l-Vasit» səh: 1010.
[2] əl-Muzzəmmil surəsi, 20-ci ayə.
[3] Səhihu-l-Buxari, 990, 998; Səhih Müslim, 174, 175.
[4] Səhihu-l-Buxari, 996; Səhih Müslim, 1434.
[5] Səhih Müslim, 1754.

q) yeddi rək'ət (altı rək'ət ardıcıl qılıb təşəhhüdü oxumaq, sonra qalxıb yeddinci rək'ət i tamamlamaq);

d) doqquz rək'ət (səkkiz rək'ət ardıcıl qılıb təşəhhüd oxumaq, sonra qalxıb doqquzuncu rək'əti tamamlamaq);

e) on bir rək'ət (on rək'əti cüt-cüt qılıb salam verməklə tamamlamaq, sonra da bir rək'ət qılmaq).[1]

**Qeyd:** Burada, ardıcıl dedikdə, rək'ətlər arasında təşəhhüdü oxumamaq nəzərdə tutulur.

Abdullah ibn Abbas (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - on üç rək'ət gecə namazı qıldı!»[2]

Vitr namazı Peyğəmbərin – **səllallahu aleyhi və səlləm** - daima qıldığı, müəkkəd (təkid olunmuş) sünnət namazıdır.[3] Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - Vitr namazını minik üzərində qılması bu namazın fərz olmamasına dəlildir.

İbn Ömər (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dəvənin üzərində Vitr namazını qıldı»[4]

Başqa rəvayətdə: «səfərdə olarkən…»[5]

**Vitr namazının vaxtı:** İşa namazının sünnəsindən sonra Sübh namazınadək.[6]

Sübh namazınadək Vitri qılmayan şəxs ondan sonra onu tək sayda yox cüt sayda qəzasını qıla bilər.[7]

Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - xəstəlikdən və ya başqa səbəbdən gecə qılmadığı namazı gündüz on iki rək'ət qılardı!» - başqa rəvayətdə - «yatıb qaldıqda»[8]

---

[1] «Teysiru-l-alləm», 1/282.
[2] Səhihu-l-Buxari, 1138.
[3] «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 4/14.
[4] Səhih Müslim, 1613.
[5] Səhihu-l-Buxari, 1000.
[6] «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 4/15.
[7] ««Məcmu fətava» 23/89-90; «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 4/17.
[8] Səhih Müslim, 1740, 1741.

## *Təravih namazı*

«Təravih»**-** istirahət, dincəlmə deməkir.[1] Müsəlmanlar təravih namazında hər dörd rək'ətdən sonra dincəldiklərinə görə belə adlanmışdır. Aişədən (r.a) rəvayət olunan hədisdə Peyğəmbər **- səllallahu aleyhi və səlləm -** də belə edərmiş.[2]

Təravih namazı camaatla on bir rək'ət səslə qılınan müəkkəd (təkid olunmuş) sünnət namazıdır. İyirmi rək'ət ilə əlaqəli hədis və əsərlər isə mötəbər deyildir.[3] Bu namazdan sonra təhəccüd namazını qılmaq istəyən şəxs imamla səkkiz və ya on rək'ət qılmalı, Vitri isə təhəccüddən sonraya saxlamalıdır.[4]

Aişə (r.a) rəvayət edir ki, Peyğəmbər **- səllallahu aleyhi və səlləm -** məsciddə gecələrin birində (Ramazanda) namaz qıldı və camaat da onunla bərabər bu namazı qıldı. Ertəsi gün yenə namaz qıldı və əvvəlkindən də çox camaat onunla bu namazı qıldılar. Üçüncü (və dördüncü) gün yenə bu hal təkrar oldu və ondan sonra Peyğəmbər **- səllallahu aleyhi və səlləm -** camaatla namaz qılmağa gəlmədi. O gecənin səhəri Peyğəmbər **- səllallahu aleyhi və səlləm -** dedi: «Sizin bu namazı qılmaq üçün belə çox sayda cəm olduğunuzu gördüm və onun sizə fərz buyrulacağından qorxduğum üçün camaat namazına gəlmədim.»[5]

**Təravih namazının vaxtı:** İşa namazının sünnəsindən sonra Sübh namazınadək.

## *Səfər namazı*

Uca **Allah** buyurur:

وَإِذَا ضَرَبْتُمْ فِى الْأَرْضِ فَلَيْسَ عَلَيْكُمْ جُنَاحٌ أَن تَقْصُرُوا مِنَ الصَّلَوٰةِ إِنْ
خِفْتُمْ أَن يَفْتِنَكُمُ الَّذِينَ كَفَرُوٓا

---

[1] [illegible]

[2] Səhihu-l-Buxari, 1147; «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 4/13.

[3] «Təmamu-l-Minnə» səh:252-256; «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 4/65-72.

[4] Vitrdən sonrakı qunut duaları üçün bax: - «Müstəcəb dualar»; «Müsəlmanın qalası».

[5] Səhihu-l-Buxari, 1129; Səhih Muslim 1780.

**«Səfərə çıxdığınız zaman kafirlərin sizə zərər yetirəcəklərindən qorxarsınızsa, namazı qısaltmaq** (dörd rək'ətli namazı iki rək'ət qılmaq) **sizə günah hesab edilməz.»**[1]

Aişə (r.a) rəvayət edir ki, səfərdə və evdə iki rək'ət qılınan namazlar fərz edildi, səfərdə qılınan namazlar təsdiq olundu, evdə qılınan namazlara isə (bir və ya iki rək'ət) əlavə olundu.»[2]

Səfərdə namazları qısaltmaq və cəm şəkildə qılmaq Uca **Allah** tərəfindən verilmiş rüxsətdir. Bilərəkdən səfərdə namazları tam qılmaq məkruhdur (bəyənilmir), cəm şəkildə qılmaq isə sünnədir.[3] Yalnız yerli sakinlərdən olan imamın arxasında namaz qılan müsafir imama tabe olaraq namazını tam qılmalıdır.

Abdullah ibn Abbas (r.a) rəvayət edir ki, «Peyğəmbər **- səllallahu aleyhi və səlləm -** səfərdə olduğu müddətdə Zöhrlə Əsr namazını, Məğriblə də İşa namazını cəm edərdi»[4]

Zöhrlə Əsr namazını Zöhrün əvvəl vaxtından Əsrin axır vaxtınadək, Məğriblə də İşa namazını Məğribin əvvəl vaxtından İşanın axır vaxtınadək istənilən vaxtda qılmaq olar.[5]

Abdullah ibn Ömər (r.a) rəvayət edir ki, «Mən Peyğəmbərə **- səllallahu aleyhi və səlləm -**, Əbu Bəkrə (r.a), Ömərə (r.a) və Osmana (r.a) yol yoldaşı oldum. Onlar səfərdə olduqları müddətdə namazları iki rək'ətdən artıq qılmazdılar»[6]

Yalnız dörd rək'ətli namazlar iki rək'ət qısaldılmış şəkildə qılınır. Məğrib namazı isə tam üç rək'ət qılınır.

---

[1] ən-Nisa surəsi, 101-ci ayə.
[2] Səhihu-l-Buxari, 350; Səhih Müslim, 1568.
[3] Bax: «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 4/509, 548.
[4] Səhihu-l-Buxari, 1107.
[5] «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 4/449.
[6] Səhihu-l-Buxari, 1102; Səhih Müslim, 1577.

Abdullah ibn Ömər (r.a) rəvayət edir ki, «Mən Peyğəmbərin **- səllallahu aleyhi və səlləm -** səfərdə Məğrib namazını üç rükət qıldığını və təxirə saldığını gördüm…»[1]

Peyğəmbərin **- səllallahu aleyhi və səlləm -** sünnəsini araşdırıb, onun **- səllallahu aleyhi və səlləm -,** müsafirə iki rükət namaz qılmağı buyurduğunu, səfər üçün nə məkan nə də üç, ya dörd, ya on iki, ya da on beş gün məhdudlaşdırmadığını görən hər bir şəxs səfərdə namazı qəsr etməlidir (qısaltmalıdır). Necə ki sələfdən (keçmiş nəsildən) bunu edənlər olub. Müsəlmanlar «Nəhavənd»- də altı ay namazlarını qəsr ediblər.[2] El arasında səfər hesab olunan məsafədə səfər namazı qılmaq caizdir.[3]

Səfərlə əlaqəli məsələlər:[4]

Birinci məsələ – təkbir gətirib (namaza başladıqdan sonra) hər hansı nəqliyyat vasitəsilə səfərə çıxan şəxs namazını tam qılmalıdır;

İkinci məsələ – təkbir gətirib (namaza başladıqdan sonra) hər hansı nəqliyyat vasitəsilə vətəninə daxil olan şəxs də namazını tam qılmalıdır;

Üçüncü məsələ – evdə qılınan namazın batil olduğunu səfərdə xatırlayan şəxs o namazı tam qılmalıdır;

Dördüncü məsələ – səfərdə qılınan namazın batil olduğunu evdə xatırlayan şəxs də o namazı tam qılmalıdır;

Beşinci məsələ – müsafir, yerli sakinlərdən olan imamın arxasında qıldığı namazı imama tabe olaraq tam qılmalıdır;

Altıncı məsələ – arxasında namaz qıldığı imamın müsafir yoxsa yerli sakin olduğunu bilməyən şəxs imamla namazını tam qılacağını niyyət edib ona tabe olmalıdır (yəni tam qılarsa tam qılmalı, qəsr edərsə qəsr etməlidir);

Yeddinci məsələ – İmama tabe olaraq namazı tam qılmağa niyyət edən müsafirin namaz əsnasında dəstəmazı pozularsa o nə etməlidir?

a) Dəstəmaz aldıqdan sonra tərk etdiyi camaat namazına çatarsa onu tam qılmalıdır.

---

[1] Səhihu-l-Buxari, 1092.
[2] «Məcmu fətava» 24/18.
[3] «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 4/498.
[4] Bax: «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 4/516-535.

b) Namaz qılınıb qurtardıqdan sonra o namazı tək qılarsa bu halda o, namazı qəsr etməlidir.

* Namazın vaxtı girdikdən sonra (o namazı qılmayıb) səfərə çıxan şəxs həmən namazı səfərdə qəsr etməlidir.

* Namazın vaxtı girdikdən sonra (o namazı qılmayıb) vətəninə daxil olan şəxs həmən namazı tam qılmalıdır.

Səkkizinci məsələ – Namazı tam və ya qəsr qılmağı niyyət etmədən namaza başlayan müsafir namazını qəsr etməlidir.

Doqquzuncu məsələ – Namazı qəsr qılmağı niyyət edib-etmədiyinə şəkk edən müsafir namazını qəsr etməlidir.

Onuncu məsələ – Müsafirin səfərdə namaz qılmasına zaman məhdudiyyəti yoxdur.

## ***Kusuf (Xusuf) namazı***

«Kusuf»- günəşin tutulmasına, «Xusuf»- isə ayın tutulmasına deyilir.

İslam alimlərinin icmasına görə «Kusuf» və «Xusuf»- günəş və ayın tam yaxud qismən tutulmasına deyilir.[1] Hər ikisinin tutulmasını həm «Kusuf» həm də «Xusuf»- adlandırmaq olar.[2]

Kusuf (Xusuf) namazı günəş və ayın tam yaxud qismən tutulduğu zaman iki rək'ətli səslə qılınan namazdır. Bu namazlardan sonra bir xütbə vermək caizdir.[3] Bu namazlardan nə sonra nə də əvvəl sünnə namazı qılınmır.

Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - zamanında günəş tutuldu və o, camaatı namaza çağırmaq üçün bir nəfər göndərdi. Onlar namaz qılmaq üçün toplandıqdan sonra Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - təkbir edib dörd ruku və dörd səcdədən ibarət iki rək'ət namaz qıldı»[4]

Əbu Məsud – Uqbətu ibn Amr – əl-Ənsari əl-Bədri (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: "Həqiqətən, günəş

---

[1] Səhih Muslimin şərhi, 6/438; «əl-Mu'cəmu-l-Vasit» səh: 787.
[2] «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 5/229.
[3] «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 5/249.
[4] Səhih Müslim, 2089.

və ay **Allahın** yaratdığı rəmzlərdir ki, **Allah** bununla (günəş və ay tutulması ilə) qullarını qorxudur. Günəş və ay heç kəsin ölümünə və ya doğulduğuna görə tutulmur. Onların tutulduğunu gördüyünüz zaman namaz qılın və bu hal sona çatana qədər **Allaha** dua edin!"»[1]

Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - zamanında günəş tutuldu və o, camaata namaz qıldırdı. Namaz əsnasında qiyam və rukunu uzatdı, sonra rukudan qalxdı və əvvəlkinə nisbətən az qiyamda durdu, sonra ruku etdi və əvvəlkinə nisbətən az rukuda qaldı, (rukudan qalxdıqdan) sonra səcdə etdi və onu da uzatdı. İkinci rək'əti də bu qaydada qılıb, artıq günəşin üzü açıldığı zaman namazını bitirdi. Sonra **Allaha** həmd-səna edib dedi: "Həqiqətən, günəş və ay **Allahın** yaratdığı rəmzlərdir. Onlar heç kəsin ölümünə və ya doğulduğuna görə tutulmur. Onların tutulduğunu gördüyünüz zaman Allaha dua edin, təkbir gətirin, namaz qılın və sədəqə verin. Ey Məhəmməd ümməti! **Allaha** and olsun ki, heç biriniz **Allahın** zina etdiyi quluna (kişi və ya qadın) qarşı qeyrətli[2] olduğu kimi (qeyrətli) ola bilməz. Ey Məhəmməd ümməti! Mənim bildiyimi bilsəniz, az gülüb çox ağlayardınız"»[3]

Əbu Musa əl-Əşari (r.a) rəvayət edir ki, «Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - zamanında günəş tutuldu. O, qiyamətin qopduğunu zənn edib məscidə gəldi və namaz qıldı. Namaz əsnasında qiyamı, rukunu və səcdəni uzatdı. Mən onun bu cür namaz qıldığını görməmişdim. Namaz qıldıqdan sonra dedi: "**Allahın** göndərdiyi bu rəmzlər, kiminsə ölümünə və doğulmasına görə deyildir, lakin **Allah** bununla qullarını qorxudur. Belə olduğunu gördüyünüz zaman **Allaha** zikr və dua etməyə, ondan bağışlanma diləməyə tələsin!"»[4]

Bu namazların hər rək'ətində olan birinci rüku rükn, ikincisi isə sünnədir. Deməli hər rək'ətdə olan birinci rükuya çatan şəxs o rək'ətə çatmış, ikinci rükuya çatan isə o rək'ətə çatmamış hesab olunur.[5]

---

[1] Səhihu-l-Buxari, 1041; Səhih Müslim, 2111.
[2] Allaha layiqdir, necəliyi bizə məlum deyil.
[3] Səhihu-l-Buxari, 1044; Səhih Müslim, 2086.
[4] Səhihu-l-Buxari, 1059; Səhih Muslim, 2114.
[5] «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 5/259-260.

**Kusuf (Xusuf) namazının vaxtı:** Günəş və ya ay tutulan andan açılanadək.

Bu namazları qılmaq vacibdir (fardu-l-kifayədir)." [1]

## ***İstisqa namazı***

Uca **Allah** buyurur:

**«**[İnsanlar] **ümidsizliyə qapılandan sonra, yağmur göndərən Odur!»**

«İstisqa»- Dua edib **Allahdan** yağış nazil etməsini istəmək deməkdir.[2]

«İstisqa», xüsusən quraqlıq olduqda (ümumən isə istənilən vaxt) dua edib **Allahdan** yağış nazil etməsini istənilən zaman iki rək'ətli səslə qılınan sünnət namazdır. Bu namazdan sonra və ya əvvəl bir xütbə vermək sünnətdir. Bu namazlardan nə sonra nə də əvvəl sünnə namazı qılınmır.[3]

Abdullah ibn Zeyd ibn Asim əl-Mazini (r.a) rəvayət edir ki, «Peyğəmbər **- səllallahu aleyhi və səlləm -** yağışın nazil olmasını **Allahdan** istəmək üçün əbasını tərsinə çevirib (geyindi), qibləyə tərəf döndü və dua etdi. Sonra iki rək'ət səslə namaz qıldı»[4]

Ənəs ibn Malik (r.a) rəvayət edir ki, «Cümə günü bir kişi, məscidə Ömərin (r.a) evinin istiqamətində olan qapıdan daxil oldu və ayaq üstə xütbə verən Peyğəmbərə **- səllallahu aleyhi və səlləm -** yaxınlaşıb dedi: "Ey **Allahın** elçisi! Mal-qara həlak olur, səfərlər də dayandırılıb (quraqlıq olduğu üçün dəvələrlə səfərə çıxmaq olmur). **Allahın** bizə yağış nazil etməsi üçün dua et!" Peyğəmbər **- səllallahu aleyhi və səlləm -** əllərini qaldırıb üç dəfə «Allahummə-sqinə» (başqa rəvayətdə «Allahummə əğisnə»)[5] **-** "**Allahım**, bizə yağış endir!" **-** deyə dua etdi».

---

[1] «Təmamu-l-Minnə», səh. 261-262; «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 5/240;4/8.

[2] «əl-Mu'cəmu-l-Vasit» səh: 437.

[3] «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 5/261-283.

[4] Səhihu-l-Buxari, 1024; Səhih Müslim, 2086.

[5] Səhihu-l-Buxari, 1014.

Ənəs (r.a) deyir ki, «**Allaha** and olsun ki, göydə nəinki bulud, heç bulud parçası da yox idi. Bizimlə Səlin[1] arasında da nə bir ev, nə də bir koma var idi. Birdən Səlin arxasından qalxanabənzər bir bulud göründü. Bulud gəlib səmanın ortasına çatdıqda yayıldı və yağış yağdı. **Allaha** and olsun ki, bir həftə gün üzü görmədik. Cümə günü bir kişi yenə məscidə Ömərin (r.a) evinin istiqamətində olan qapıdan daxil oldu və ayaq üstə xütbə verən Peyğəmbərə - **səllallahu aleyhi və səlləm** - yaxınlaşıb dedi: "Ey **Allahın** elçisi! Mal-qara həlak olur, səfərlər də dayandırılıb (yolları su basdığı üçün dəvələrlə səfərə çıxmaq olmur). **Allaha**, yağışı dayandırması üçün dua et!" Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - əllərini qaldırıb dua etdi və dedi: "Allahummə həvaleynə va lə əleynə, Allahummə alə-l-əkəm va-z-zirab va butuni-l-əudiyə va mənabiti-l-əşcar". Bu duadan sonra buludlar çəkildi və biz qızmar günəşin altında gəzişməyə başladıq».

Şureyk deyir ki, «Mən Ənəsdən (r.a): "O (ikinci dəfə gələn kişi) həmən kişi (birinci dəfə gələn) idi?" – deyə soruşduqda, o: "Bilmirəm" – deyə cavab verdi»[2]

Duanın tərcüməsi: «**Allahım**, bu yağışı bizim üzərimizə yox, ətraf yerlərə endir! **Allahım**, bu yağışı yaylaların, təpələrin, vadilərin üzərinə və ağacların dibinə endir!»

## ***İstisqa namazının qılınması*** [3]

İmam birinci rək'ətdə ihram təkbirindən və istiftah duasını oxuduqdan sonra altı dəfə təkbir etməli və adi sünnət namazının qılındığı qaydada həmən rək'əti tamamlamalıdır. İkinci rək'ətə qalx-dıqdan sonra isə beş dəfə təkbir etməli və adi sünnət namazının qılındığı qaydada həmən rək'əti tamamlamalıdır. Camaat da imama tabe olaraq bu hərəkətləri yerinə yetirməlidirlər. İmam **Allahı** həmd-səna etməklə, Ondan bağışlanma diləməklə xütbəni başlamalı, sonra mömünləri cənnətlə müjdələməli, cəhənnəm əzabından çəkindirməli,

---

[1] Mədinə şəhərindəki dağın adıdır.
[2] Səhihu-l-Buxari, 1013; Səhih Müslim, 2075.
[3] «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 5/261-287.

günahlara görə tövbə etmələrini biri-birilərinə nifrət etməmələrini və s. lazimi nəsihətləri verməlidir. Sonra əllərini göyə tərəf qaldırıb Allahdan yağışın nazil etməsi üçün dua etməlidir.[1]

## ***Xauf namazı***

Uca **Allah** buyurur:

فَإِنْ خِفْتُمْ فَرِجَالًا أَوْ رُكْبَانًا فَإِذَا أَمِنتُمْ فَاذْكُرُوا اللَّهَ كَمَا عَلَّمَكُم
مَّا لَمْ تَكُونُوا تَعْلَمُونَ ﴿٢٣٩﴾

**«Əgər** (düşməndən və yırtıcı heyvandan) **qorxsanız,** (namazınızı) **piyada gedə-gedə və ya minik üstə qılın.** (Təhlükədən sovuşmağınıza) **əmin olduqda isə Allahı, bilmədiyiniz şeyləri** (namazı, duanı) **sizə** (Quran və peyğəmbər vasitəsilə) **nə cür öyrədibsə, o cür anın** (zikr edin, namaz qılın).**»**[2]

«Xauf» – qorxu deməkdir (yəni, hər hansı bir hadisədən yaranmış həyacan)[3]

Hər hansı bir namazı başqa formada qılmağa rüxsət verən üzr üçdür: Səfər, xəstəlik və qorxu. Qorxu namazının neçə qılınması aşağıdakı kimidir.[4]

Birinci forma: Bax – ən-Nisa surəsi, 102-ci ayə!

Yezid ibn Rumən, Saleh ibn Xavvət ibn Cubeyrdən, o da Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - ilə bərabər «Zatu-r-Riqa» döyüşündə qorxu namazı qılan səhabədən[5] rəvayət edir ki, «Bir dəstə, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - ilə bərabər namaza başladı, o biri dəstə isə (onları qorumaq üçün) düşmənə tərəf döndü. Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - bir rək'ət qıldıqdan sonra ayağa

---

[1] Hədisdə varid olan duadan əlavə dualar etmək üçün bax: «Müsəlmanın qalası».

[2] əl-Bəqərə surəsi, 239-cu ayə.

[3] «əl-Mu'cəmu-l-Vasit» səh: 262.

[4] «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 4/579-583.

[5] Peyğəmbər - **səllallahu aleyhi və səlləm** -ilə bərabər namaz qılan səhabə Səhl ibn Əbi Həsmətədir (r.a).

qalxıb səhabələr ikinci rək'əti sərbəst (salam verib namazı) tamamlayana qədər hərəkətsiz dayanıb gözlədi. Dəstələr yerlərini dəyişdirdikdən sonra ikinci rək'əti qıldı və o biri dəstə (birinci rək'əti onunla qıldıqdan sonra) ikinci rək'əti tamamlayana qədər hərəkətsiz dayanıb gözlədi. Sonra isə (onlardan əvvəl) salam verib namazı tamamladı»[1]

İkinci forma: Cabir ibn Abdullah əl-Ənsari (r.a) rəvayət edir ki, «Mən Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - ilə qorxu namazını qıldım. O, bizi iki cərgəyə düzdü və düşmən mövqeyi bizimlə qiblə arasında olduğu vəziyyətdə namaza başladı. Biz onunla bərabər təkbir və ruku etdik, sonra da rukudan qalxdıq. O, birinci səf ilə bərabər səcdə etdiyi zaman ikinci səf düşmənə qarşı dayanıb gözlədi. Onlar (hər iki) səcdəni etdikdən sonra ikinci səf də səcdə etdi. Ayağa qalxdıqdan sonra isə cərgələr yerlərini (1-ci cərgə 2-ci cərgənin, 2-ci cərgə də 1-ci cərgənin yerinə keçməklə) dəyişdirdi və ikinci rək'əti də əvvəlki rək'ət kimi qıldıq. Sonra isə hamımız onunla bərabər salam verib namazı bitirdik».

Cabir (r.a) deyir ki, «(Onların qıldığı namaz) keşikçilərimizin əmirlərini qoruduğu zaman qıldıqları namaz kimidir»[2]

Başqa rəvayətdə: «O, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - ilə bərabər qorxu namazını yeddinci döyüşdə – Zətu-r-Riqa döyüşündə qıldı»[3]

## ***Duha namazı***

«Duha» – səhər, gündüzün başlanğıcına deyilir.[4]

Duha namazı iki rək'ət və daha çox cüt sayda qılınan sünnət namazıdır. Bu namazın neçə rək'ət qılınmasına heç bir məhdudiyyət yoxdur.[5]

Əbu Zər (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: «Hər biriniz bədən sümüklərinin və oynaqlarının haqqını

---

[1] Səhihu-l-Buxari, 4129; Səhih Müslim, 1944.
[2] Səhih Müslim, 1943.
[3] Səhihu-l-Buxari, 4125.
[4] «əl-Mu'cəmu-l-Vasit» səh: 535.
[5] «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 4/117-119.

ödəməlidir. Hər bir təsbih[1], hər bir təhmid[2], hər bir təhlil[3], hər bir təkbir[4] sədəqədir. Yaxşı işləri əmr etmək və pis işlərdən çəkindirmək sədəqədir. Duha namazı isə bunların hamısını əvəz edir!»[5]

Əbu Hureyrə (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - üç şeyi mənə nəsihət etdi: Hər ayın üç gününü oruc tutmağı, iki rək'ət Duha namazı və yatmazdan əvvəl Vitr namazını qılmağı!»[6]

Ummu Hani (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - Məkkənin fəthi günü səkkiz rək'ət Duha namazı qıldı»[7]

Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - Düha namazını daima qılmazdı ki, ümmətinə fərz buyrulmasın.»[8]

Aişə (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dörd rək'ət Duha namazı qılar və istədiyi qədər rək'ətlərin sayını artırardı.»[9]

**Duha namazının vaxtı:** Günəş üfüqdən bir nizə hündürlüyündə qalxdıqdan sonra (yəni, təqribən günəş çıxdıqdan on beş dəqiqə sonra) günəş səmanın ortasına (zenitə) yüksəlməsindən bir az əvvələdək (təqribən on dəqiqə qabaq).[10]

## ***Təhiyyat namazı***

Təhiyyat – salam deməkdir.[11]

Bu, məscidə daxil olduqda səssiz qılınan iki rək'ətli sünnət namazıdır. Bu namazı günün istənilən vaxtı məscidə daxil olduqda qılınmalıdır.

---

[1] «Subhanəllah» - demək;
[2] «Əlhəmdulilləh» - demək;
[3] «Lə iləhə illəllah» - demək;
[4] «**Allahu** Əkbər» - demək;
[5] Səhih Muslim, 1668.
[6] Səhih Muslim, 1669.
[7] Səhihu-l-Buxari, 1176; Səhih Muslim, 1664; «Zadu-l-Məad» 1/342.
[8] Səhih Muslim, 1659.
[9] Səhih Muslim, 1662.
[10] «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 4/122-123.
[11] «əl-Mu'cəmu-l-Vasit» səh: 213.

Cabir ibn Abdullah (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - cümə xütbəsini verdiyi zaman bir kişi gəlib oturdu. Peyğəmbər **- səllallahu aleyhi və səlləm -** ondan: "Namaz qıldınmı?" – deyə soruşduqda, o: "Yox"- dedi. Peyğəmbər **- səllallahu aleyhi və səlləm** - də ona əmr edib dedi: "Dur iki rək'ət namaz qıl!"»[1]

Əbu Qatədə əl-Ənsari[2] (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: "Sizdən biriniz məscidə daxil olduqda iki rək'ət namaz qılmamış oturmasın"»[3]

## ***Cənazə namazı***

Cənazə namazının fəziləti:

Əbu Hüreyrə (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - dedi: "Cənazəni müşahidə[4] edib namazını qılana bir, (ondan sonra) dəfn olunana qədər onu təqib edənə isə iki qirat qədər savab yazılır". Səhabələr: "İki qirat nə qədərdir?" – deyə soruşduqda, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - "İki böyük dağ kimidir" – deyə cavab verdi»[5]

Başqa rəvayətdə: «Qiratların ən kiçiyi Uhud dağı kimidir»[6]

" Tabutun üzərində olan şəxs «Cənazə» adlanır. Tabutun özü isə «Cinazə» adlanır. Çünki, məna baxımından «fəthə»- hərfin üstündə olduğu üçün tabutun üzərində olana, «kəsrə»- də hərfin altında olduğu üçün meyitin altında olana münasibdir.

Cənazə namazı dörd təkbirdən ibarət rüku və səcdəsiz səssiz qılınan namazdır."[7]

Əbu Hüreyrə (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - Nəcaşinin[1] ölüm xəbərini elan etdikdən sonra namaz qılınan

---

[1] Səhihu-l-Buxari, 930; Səhih Müslim, 2017.

[2] Adı: əl-Haris ibn Rabi.

[3] Səhihu-l-Buxari, 1167; Səhih Müslim, 1651.

[4] Meyitin yuyulub kəfənlənməsində iştirak etmək.

[5] Səhihu-l-Buxari, 1325; Səhih Müslim, 2186.

[6] Səhih Müslim, 2189.

[7] «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 5/298; «əl-Mu'cəmu-l-Vasit» səh: 140.

yerə gəldi, cərgələri düzdü və dörd təkbirli (rüku və səcdəsiz) namaz qıldı»[2]

Bu hədisdən belə nəticə də çıxır ki, qəriblikdə ölən şəxs üçün cənazə namazı qılınıbsa, qeyriləri üçün bu namazı qılmaq olmaz. Əks halda isə, cənazə müşahidə olunmasa belə, bu namazı qılmaq vacibdir (fardu-l-kifayədir).

Cənazə namazını camaatla qılmaq əfzəldir. Lakin qeyd etmək lazımdır ki, ölən şəxs dəfn olunduqdan sonra qəbrinin önündə dayanıb onun cənazə namazını qılmaq olar.

Cabir (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - Nəcaşinin (cənazə) namazını qıldığı zaman mən ikinci və ya üçüncü səfdə idim»[3]

Abdullah ibn Abbas (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - meyit dəfn olunduqdan sonra qəbrin önündə dayanıb dörd təkbirli (rüku və səcdəsiz) namaz qıldı»[4]

Əbu Hureyrə (r.a) rəvayət edir ki, «Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - məscidinə xidmət edən bir şəxs vəfat etdi və Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - onun vəfat etdiyini bilmədi. Bir gün Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - o şəxs barəsində soruşdu. Səhabələr onun vəfat etdiyini ona xəbər verdikdə o dedi: " Doğrudanda siz mənə (onun vəfat etdiyini xəbər verməməklə) əziyyət vermisiniz!" Sonra qəbrin yerini soruşdu və gedib onun cənazə namazını qıldı.»[5]

Kişiyə cənazə namazı qılınarkən imam onun baş tərəfində, qadına cənazə namazı qılınarkən isə onun tən orta istiqamətində dayanmalıdır.

Əbu Ğalib əl-Xayyat rəvayət edir ki, «Mən Ənəs ibn Malikin (r.a) cənazə namazı qıldığını müşahidə etdim. O, kişi xeylağının cənazəsinin baş tərəfində durdu və namaz qıldı. Sonra Qureyş qəbiləsindən ya da ənsarlardan olan qadın xeylağının cənazəsini gətirdilər və dedilər: "Bu filankəsin qızıdır onun cənazə namazını

---

[1] Bu, Həbəşistan krallarının tituludur. Qeyd olunanın adı Əshəmədir.
[2] Səhihu-l-Buxari, 1333; Səhih Müslim, 2201.
[3] Səhihu-l-Buxari, 3878.
[4] Səhih Müslim, 2208.
[5] Səhihu-l-Buxari, 1337.

qıl!" Ənəs (r.a) meyitin orta nahiyəsində dayandı və cənazə namazını qıldı. Bu fərqi görən ibn Zeyd əl-Adəvi ona dedi: "Ey Əbu Həmzə! Məgər Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - belə namaz qılardı?" O: "Bəli" – deyə cavab verdi. İbn Zeyd bizə tərəf döndü və dedi: «Öyrənin!»[1]

Bu hədis həmçinin ölən şəxsin kişi, qadın və ya uşaq olduğunu namaz qılan camaata bildirməsinə də dəlildir.

Səmurə ibn Cundəb (r.a) rəvayət edir ki, «Mən Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - ilə nifasdan[2] vəfat etmiş qadının cənazə namazını qıldım. O, namazda ikən (axıra qədər) meyitin orta nahiyəsində dayandı»[3]

Cənazə namazını qılmaq kişilər üçün fardu-l-kifayədir. Qadınlara isə Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - cənazəni təqib etməyi (bura cənazə namazı da daxildir) qadağan etmişdir.[4]

Ummu Atiyyə əl-Ənsariyyə (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - bizə (qadınlara) cənazəni təqib[5] etməyi qadağan etdi, lakin haram olmasını təkid etmədi»[6]

Kafir, müşrik və münafiqin cənazə namazı qılınmır.

Uca **Allah** buyurur:

وَلَا تُصَلِّ عَلَىٰٓ أَحَدٍ مِنْهُمْ مَاتَ أَبَدًا وَلَا تَقُمْ عَلَىٰ قَبْرِهِۦٓ إِنَّهُمْ كَفَرُوا بِاللَّهِ
وَرَسُولِهِۦ وَمَاتُوا وَهُمْ فَاسِقُونَ ﴿٨٤﴾

[1] «Müsnəd» 3/118; «Sünənu Əbi Davud» 3194-cü hədis; «Sünənu-t-Tirmizi» 1039-cu hədis; «Sünən ibn Macə» 1494-cü hədis; «Müsnədu-t-Tayalisi» 776-cı hədis; «Əhkamu-l-Cənaiz» səh: 138-139.

[2] Nifas – uşaq doğduqdan sonra, adətən qırx günə qədər qadının fərcindən gələn qana deyilir. Nifasdan: yə'ni, nifas olan müddətdə və ya nifas qanından ya da doğuşda.

[3] Səhihu-l-Buxari, 1331; Səhih Müslim, 2234.

[4] «Məcmu fətava» 24/245.

[5] Təqib – cənazəni qəbiristanlığa qədər müşayiət etmək və dəfn mərasimində iştirak etməkdir.

[6] Səhihu-l-Buxari, 1278; Səhih Müslim, 2164.

**«Münafiqlərdən ölən heç bir kəsin namazını heç vaxt qılma, qəbrinin başında durma. Çünki onlar Allahı, Onun Peyğəmbərini dandılar və fasiq olaraq öldülər.»**[1]

Cənazə namazının qılınması üçün heç bir vaxt məhdudiyyəti yoxdur.

## *Cənazə namazının qılınması*

Cənazə namazında birinci təkbirdən sonra Fatihə surəsi oxunur, ikinci təkbirdən sonra Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - salavat oxunur (bax: namaz qılmağın qaydası), üçüncü təkbirdən sonra vəfat edən şəxs üçün dua oxunur və dördüncü təkbirdən sonra bir və ya hər iki tərəfə salam verməklə namaz tamamlanır.

Vəfat edən şəxs üçün oxunan dua:

Əbu Hüreyrə (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - cənazə namazını qıldıqda bu duanı oxuyardı: «Allahummə-ğfir liheyyinə və meyyitinə, və şahidinə və ğaibinə, və sağirinə və kəbirinə, və zəkərinə və unsanə! Allahummə mən əhyəytəhu minnə fə əhyihi alə-l-isləmi, və mən təvafféytəhu minnə fətəvafféhu alə-l-iymən»[2]

Duanın tərcüməsi: «**Allahım,** dirilərimizi də, ölülərimizi də, burada olanlarımızı da, olmayanlarımızı da, kiçiklərimizi də, böyüklərimizi də, kişilərimizi də, qadınlarımızı da bağışla! **Allahım,** bizlərdən yaşatdığını müsəlman kimi yaşat, öldürdüyünü də imana gətirib öldür!»

Auf ibn Malik əl-Əşcəi (r.a) «mən Peyğəmbərin - **səllallahu aleyhi və səlləm** - cənazə namazında bu duanı oxuduğunu eşitdim: «Allahummə-ğfir ləhu vər-həmhu və afihi va'fu anhu, və əkrim nuzuləhu və vassi mudxaləhu, vəğ-silhu biməin və səlcin və bəradin, və nəqqihi minə-l-xataya kəmə yunəqqa-s-səubu-l-əbyadu minə-d-dənəsi, və

---

[1] ət-Tövbə surəsi, 84.

[2] «Müsnəd» 2/368; «Sünənu Əbi Davud» 3201-ci hədis; «Sünənu-t-Tirmizi» 1024-cü hədis; «Sünən İbn Macə» 1498-ci hədis; «Səhih ibn Hibban» 757-ci hədis; «Əhkamu-l-Cənaiz» səh: 157-158.

əbdilhu dəran xayran min dərihi və əhlən xayran min əhlihi və zəucən xayran min zəucihi, və ədxilhu-l-cənnətə və əizhu min azəbi-l-qabri və azəbi-n-nər!»[1]

Duanın tərcüməsi: «**Allahım,** onu bağışla, ona rəhm et, onu günahlarından uzaqlaşdır, onun günahlarından keç, yeni məskunlaşdığı yerini onun üçün şərəfli et, daxil olduğu qəbrini genişlət, onu su, qar və dolu ilə yu, onu günahlarından ağ paltar kirdən təmizlənən kimi təmizlə, onun evinin əvəzinə daha xeyirli ev, ailəsinin əvəzinə daha xeyirli ailə, zövcəsinin əvəzinə daha xeyirli zövcə ver!»[2] Onu Cənnətə daxil et, ona qəbr əzabından Cəhənnəm odunun əzabından sığınacaq ver!»

***** Qadın üçün dua etdikdə: «hu, hi» bitişən əvəzliklərinə müvafiq olaraq «hə» bitişən əvəzliyi ilə dəyişmək lazımdır.

***** İki nəfər üçün dua etdikdə: «hu, hi» bitişən əvəzliklərinə müvafiq olaraq «humə, himə» bitişən əvəzlikləri ilə dəyişmək lazımdır.

***** İkidən çox kişilər üçün dua etdikdə: «hu, hi» bitişən əvəzliklərinə müvafiq olaraq «hum, him» bitişən əvəzlikləri ilə dəyişmək lazımdır.

***** İkidən çox qadınlar üçün dua etdikdə: «hu, hi» bitişən əvəzliklərinə müvafiq olaraq «hunnə, hinnə» bitişən əvəzlikləri ilə dəyişmək lazımdır.[3]

## ***Təsabih namazı***

«Təsabih» - «Təsbih»-in cəmidir – yəni, hədsiz tərifləmə, şöhrətləndirmə və bütün nöqsanlardan uzaqlaşdırmaq deməkdir.[4]

Abdullah ibn Abbas (r.a) rəvayət edir ki, Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - (əmisi) Abbasa (r.a) dedi: «Ey əmim Abbas! Sənə elə

---

[1] Səhih Muslim, 2231.

[2] Bu cümlə, vəfat etmiş şəxsin mömin ailəsinin axirətdə onunla olacağını inkar etmir, sadəcə fəzilət baxımından daha artığını istəməkdir. «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 5/412.

[3] «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi» 5/414.

[4] «əl-Mu'cəmu-l-Vasit» səh: 413.

var-dövlət, bəxşiş verim ki, ona əməl etsən **Allah** sənin on xislətini (nöqsan, qüsur, eyib) – əvvəldə və sonda, keçmişdə və hazırda, qəsdən və səhvən, kiçik və böyük, gizlində və aşkarda olan günahlarını bağışlasın? Dörd rək'ət namaz qıl! Hər rək'ətində Fatihə surəsini və digər surələr oxu! Birinci rək'ətdə surələri oxuyub qurtardıqdan sonra qiyamda ikən on beş dəfə «Subhanəllahi vəl-həmdulilləhi və lə iləhə illəllahu vəllahu əkbər» de! Sonra rüku et və (o vəziyyətdə) on dəfə bu duanı de! Sonra rükudan qalx dikəl (və qiyamda) on dəfə bu duanı de! Sonra səcdə et və (o vəziyyətdə) on dəfə bu duanı de! Sonra səcdədən qalx otur və (o vəziyyətdə) on dəfə bu duanı de! Sonra bir daha səcdə et və (o vəziyyətdə) on dəfə bu duanı de! Sonra səcdədən qalx otur və (o vəziyyətdə) on dəfə bu duanı de! Hər rək'ət əsnasında duaların cəmi sayı yetmiş beş olmaqla dörd rək'ətdən ibarət namaz qıl! İmkan daxilində gündə bir dəfə, yaxud Cüm'ədə (həftədə) bir dəfə, yaxud ayda bir dəfə, yaxud ildə bir dəfə, yaxud da ömründə bir dəfə olsa belə bu namazı qıl!»[1]

"Bu hədisin mötəbər olduğunu təsdiq edən alimlər aşağıdakılardır:

ibn Məndə, ibn Həcər, əl-Əcurri, Xətib əl-Bəğdadi, əbu Səd əs-Səm'ani, əl-Munziri, ibnu-s-Salah, ən-Nəvəvi və digərildəri."[2]

Bu namazı qadağan olunmuş vaxtlardan başqa istənilən vaxt qılmaq caizdir.

Qadağan olunmuş vaxtlar aşağıdakılardır:

**1.** Fəcr namazından sonra gün çıxanadək;

**2.** Gün çıxan anda (üfüqdən bir nizə hündürlüyündə qalxana qədər);

**3.** Günəş səmanın ortasında (zenitdə) olduqda;

**4.** Əsr namazından sonra günəş batanadək;

**5.** Gün batan anda;

Qeyd etmək lazımdır ki, hər hansı bir səbəbdən yalnız fərz və sünnədə icazə verilmiş nafilə namazlarını bu vaxtlarda qılmaq olar.

---

[1] «Sünənu Əbi Davud» 4/124, 1293-cü hədis.

[2] «Aunu-l-Məbud» 4/124.

## ***İstixarə***

İstixarə – **Allahdan** uğur və kömək diləmək deməkdir.[1]

Cabir ibn Abdullah (r.a) rəvayət edir ki, «Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - Qurandakı surələri bizə öyrətdiyi kimi istixarə duasını da bizə öyrədər və deyərdi: Sizdən biriniz çətin vəziyyətə düşdükdə iki rək'ət namaz qılsın və desin: " Allahummə inni əstəxirukə bi ilmikə və əstəqdirukə bi qudratikə və əs'əlukə min fadlikə-l-azim. Fə innəkə təqdiru və lə əqdiru və tə'ləmu və lə ə'ləmu və əntə alləmu-l-ğuyub. Allahummə in kuntə tə'ləmu ənnə həzə-l-əmra xayrun li fi diyni və məaşi və aqibəti əmri fəq-durhu li və yəssirhu li summə barik li fih. Və in kuntə tə'ləmu ənnə həzə-l-əmra şərrun li fi diyni və məaşi və aqibəti əmri fəs-rifhu anni vəs-rifni anhu vəq-dur liyə-l-xeyra heysu kənə summə ərdini bih."»[2]
«aqibəti əmri» ifadəsinin yerinə «acili əmri və əcilihi» demək olar.

Duanın tərcüməsi: «**Allahım**, Öz elminlə mənə kömək etməyini və Öz qüdrətinlə məni qüdrətləndirməyini yalnız Səndən diləyirəm və Sənin lütf və mərhəmətindən istəyirəm! Həqiqətən Sən mənim qadir olmadığım hər şeyə qadirsən, mənim bilmədiyim hər şeyi bilirsən və Sən qeybləri bilənsən! **Allahım**, bu iş mənim dinim, yaşayışım və aqibətim üçün xeyirlidirsə onu mənim üçün qabaqcadan müəyyən edilmiş et və bu işi mənim üçün asnlaşdır və bərəkətli et! Bu iş mənim dinim, yaşayışım və aqibətim üçün zərərlidirsə (şər və təhlükə varsa) onu məndən məni də ondan uzaq et! İstədiyin qədər mənə xeyir nəsib et və Öz müqəddəratınla (qəzavü-qədərinlə) məni məmnun et!»

" İbn Teymiyyədən istixarə duasının namaz əsnasında yoxsa ondan sonra oxunacağı barəsində soruşdular. O dedi: « İstixarə duasını namaz əsnasında, yaxud salamdan əvvəl, yaxud da ondan sonra etmək olar. Salamdan əvvəl edilən dua isə əfzəl hesab olunur. Çünki Peyğəmbər - **səllallahu aleyhi və səlləm** - çox vaxt duanı salamdan əvvəl edərdi.»"[3]

---

[1] «əl-Mu'cəmu-l-Vasit» səh: 264.
[2] Səhihu-l-Buxari, 1166-cı hədis.
[3] «Məcmu fətava» 23/177.

## İstifadə olunan ədəbiyyat


əl-Qur'anu-l-Kərim;
Qur'ani-Kərim (Z. Bünyadov və V. Məmmədəliyevin tərcüməsi);
Abdullah Ali Bəssəmin «Teysiru-l-alləm»- əsəri;
Əbu Davudun «Sünən»- əsəri;
əd-Daraqutninin «Sünən»- əsəri;
əz-Zeyləinin «Nasbu-r-rayə»- əsəri;
Əhmədin «Müsnəd»- əsəri;
əl-Beyhəqinin «Sünən»- əsəri;
əl-Albaninin «Səhih hədislər silsiləsi»- əsəri;
əl-Albaninin təhqiq etdiyi «İrvau-l-Ğalil»- əsəri;
əl-Albaninin «Təmamu-l-Minnə»- əsəri;
əl-Albaninin «Sifətu salətu-n-Nəbiyyi - **səllallahu aleyhi və səlləmə**» – əsəri;
əl-Albaninin «Əhkamu-l-Cənaiz»- əsəri;
əl-Albaninin «Ədəbu-z-Zifaf»- əsəri;
«əl-Mu'cəmu-l-Vasit» - ərəb sözlərinin izahlı lüğəti (ərəbcə);
əl-Hakimin «Mustədrak»- əsəri;
ən-Nəsainin «Sünən»-əsəri;
ən-Nəvəvinin «əl-Məcmu»- əsəri;
ət-Tayalisinin «Müsnəd»- əsəri;
əş-Şəukaninin «Neylu-l-Əutar»- əsəri;
«Haşiyətu ibn Abidin»;
İbn Macənın «Sünən»- əsəri;
İbn Hibbanın «Səhih»- əsəri;
İbn Əbi Şeybənin «əl-Musannəf»- əsəri;
İbn Qudamənin «əl-Muğni»- əsəri;
İbn Teymiyyənin «Fətvalar toplusu»;
İbn Teymiyyənin «əl-İxtiyarat»- əsəri;
İbn Qeyyimin «Zadu-l-Məad»- əsəri;
İbn Qeyyimin «Kitabu-s-salah»- əsəri;
İbn Kəsirin təfsiri;
İbn Həcərin «Fəthu-l-Bari»- əsəri;
İbn Həcərin «ət-Təlxis»- əsəri;
İbn Bazın «Namazla əlaqəli mühüm fətvalar»- əsəri;

İbn Useyminin «əş-Şərhu-l-Mumti alə Zadu-l-Mustəqnəi»- əsəri;
Muhəmməd Şəmsu-l-Haqqın «Aunu-l-Məbud»- əsəri;
«Mən nə üçün… və necə namaz qılıram» (Ə. Əmirəhmədov).
«Səhihu-l-Buxari»;
«Səhih Muslim»- ən-Nəvəvinin şərhi;
Seyid Sabiqin «Fiqhu-s-Sünnə»- əsəri;
Tirmizinin «Sünən»-əsəri;

# KİTABIN İÇİNDƏKİLƏR